**AZƏRBAYCAN RESPUBLİKASI**

# ELMİ İŞ

**humanitar elmlər üzrə aylıq beynəlxalq elmi jurnal**

# SCIENTIFIC WORK

**monthly International scientific journal on humanitarian sciences**

# НАУЧНАЯ РАБОТА

**ежемесячный международный научный журнал по гуманитарным дисциплинам**

**№5(6)**

**Bakı – Baku –Баку**

**2019**

## DİLÇİLİK LINGUISTICS ЯЗЫКОЗНАНИЕ

**Niftəliyeva Elnarə Gülağa qızı**
Azərbaycan Dövlət Pedoqoji Universiteti

# ENANTİOSEMİYA HADİSƏSİNİN LEKSİK-SEMANTİK MAHİYYƏTİ

***Açar sözlər:*** *enantiosemiya, leksik-semantik mahiyyət, əks mənalı sözlər, leksik üsul , alınma sözlər, fellər, dilin lüğət tərkibi*
***Key Words:*** *enantiosemia, lexical-semantic essence, opposite meaningful words, lexical way, borrowed words, verbs, language dictionary content*
***Ключевые слова:*** *Энантиосемия, лексико-семантическая сущность, противоположные значение слов, лексический состав, глагол, словарного запаса языка*

Müasir Azərbaycan ədəbi dili lüğət tərkibi baxımından zəngin dillərdən biridir. Dilimizin lüğət tərkibi həyat inkişaf etdikcə, xalqın mədəni səviyyəsi yüksəldikcə artır, çoxalır və eyni zamanda zənginləşir. Hər bir dilin sürətlə inkişaf edən, dəyişən hissəsi lüğət tərkibidir.

Müasir Azərbaycan ədəbi dilinin lüğət tərkibinin uzun bir inkişaf tarixi vardır. Lüğət tərkibi ya başqa dillərdən hazır leksik vahidlər almaqla, ya da dilin öz daxili imkanları, sözlərin mənaca dəyişməsi ilə əlaqədar zənginləşir.

Hər bir müasir dildə bu və ya digər məfhumu ifadə etmək üçün yeni-yeni sözlər və ifadələr meydana çıxır, dilin lüğət tərkibini inkişaf etdirir.

Başqa müasir dillər kimi, Azərbaycan ədəbi dili də, başlıca olaraq, öz daxili imkanları və başqa dillərdən alınmalar hesabına inkişaf edir və lüğət tərkibini zənginləşdirir (6,394).

Dilimizin öz daxili imkanları hesabına inkişafı lüğət tərkibinin zənginləşməsində başlıca meyar hesab olunur, dilin varlığını və müstəqilliyini şərtləndirən əsas amillərdən sayılır (5,278).

Azərbaycan dilində enantiosemiya eyni səs tərkibinə malik əks mənalı sözlər dilin lüğət tərkibinin inkişafında xüsusi rol oynayır və əmələ gəlmə yollarına görə aşağıdakı kimi təsnif olunur:

Azərbaycan dilində, dilin daxili imkanları hesabına yaranan enatiosemiya hadisəsi eyni səs tərkibinə malik əks mənalı sözlər söz yaradıcılığında iştirakına görə üç qrupa ayrılır:

***1. Leksik yolla əmələ gələn sözlər***
***2. Morfoloji yolla əmələ gələn sözlər***
***3. Sintaktik yolla əmələ gələn sözlər***

***Leksik yolla əmələ gələn enantiosemiya hadisəsi (eyni səs tərkibinə malik əks mənalı sözlər)***

Leksik yolla əmələ gələn sözlərin müasir ədəbi dilimizin lüğət tərkibinin zənginləşməsində müəyyən rolu vardır (7,62).

***Misallara diqqət yetirək:***

***Əmr etmək, hökm etmək***

[Şah] bir dəqiqədən sonra başını qaldırıb Mirzə Sədrəddinə *buyurdu* ki: -Xub, mürəxxəssən, get .

[İvan bəy:] Səsini kəs, *buyuraram* başına yüz tatarı vurarlar (1,367).

Bəli, sizin “qulunuz” salam deyir uzaqdan,
*Buyurun*, cavab verin, nə fayda var susmaqdan? (11,39).

***Söyləmək, demək, təklif etmək (hörmət və nəzakət ibarəsi olub, bəzən zarafat, yaxud kinayə və istehza üçün deyilir)***

Nə *buyurursunuz*?- [Pirverdi bəy:] Bir sözü ki, böyüklərim mənə *buyurublar*, mən gərək ona əməl eləyəm .

[Səftərqulu:] Ağlım yoxdur, ağlı hardan tapım, *buyur*, görək .

[Kazım ağa:] Yoldaş özü *buyurdu* ki, dur get evə, qonaqlar gələcək, hazırlıq gördür .

[İlyasov:] Əyləş, Kazım dayı! Ümumi sözü deməyə nə var: *buyur* gəlsin, eşidirəm (1,367).

Azərbaycan dilinin izahlı lüğətində felin əks mənaları və mənalara dair nümunələr aşağıdakı şəkildə verilir:

***Xilas olmaq, özünü xilas etmək, qurtulmaq, nicat tapmaq***

İran şahları və başqaları.. düşməndən qaçıb *qurtarmaq* məqsədi ilə bu əcaib ölkəsi olan Qafqaza pənah.

***Ölmək, keçinmək***

Amma anam onların köçməyini eşitcək, *qurtaracaq*, yəqin bil ki, haman dəqiqə keçinəcək (2,219).

***Öyrətmək***

Müasir Azərbaycan ədəbi dilində geniş işlənmə dairəsinə malik olan eyni səs tərkibli ***öyrətmək*** felinin izahlı lüğətdə: *bilik, sənət, peşə vermək, təlim etmək* və adətən mənfi mənada işlənən *sövq etmək, təhrik etmək* kimi enantiosemiya hadisəsi sayılan əks mənaları var. Bu felin ifadə etdiyi əks mənalara və bu mənalara dair nümunələrə nəzər yetirək:

***Bilik, sənət, peşə vermək, təlim etmək***

[Adil:] [Atam] əlləri salamat olan müharibə əlillərinə xarratlıq *öyrədirdi* (3,559).

Canımın səfası üçün iki cür səvab edibdi,
Biri - göstərib səxavət, biri də söz *öyrədibdi* .

***Son***

Yazılış, forma və tələffüzcə eyni olan ***son*** sözünün dilimizə məxsus izahlı lüğətdə iki əks mənası verilir: *bir şeyin qurtaracağı, nəhayəti, axırı*; *axır* və *ən yeni, ən təzə, yenicə meydana çıxmış*. Həmin əks mənalar aşağıdakılardır:

***1. Bir şeyin qurtaracağı, nəhayəti, axırı; axır***

Bayramın Məşədibəygilə qonaq gəldiyi ilk gün *son* gün olmadı
Əhmədov Əzizi ancaq işin *sonunu* xəbər verən zəng çalınanda buraxdı (4,135).

***2. Ən yeni, ən təzə, yenicə meydana çıxmış***

*Son* moda. Elmin *son* nailiyyətləri. *Son* xəbərlər
Patefonda *son* dəbli bir oyun havası çalınır (2,135).
Şeirimiz öz fikir donunu yoxsa,
İndi "*son modada*" geyinməlidir? (9,42).

***Yaman***

Eyni səs kompleksinə malik ***yaman*** sözünün *pis* və birinci mənanın əksinə: *çox yaxşı*, *əla* mənaları əksmənalılığın ifadəsinə xidmət edir. Bu sözün sözdaxili antonimlik yaradan əks mənalarına və onlara dair nümunələrə diqqət yetirək:

***1. Pis***

O, utancaq və titrək səslə: "*Yaman* gün görməyəsən, oğlum, inşallah mən də xəcalətindən çıxaram" - dedi (8,84).

Bu dünyada üç şey başa bəladı;
*Yaman* oğul, *yaman* arvad, *yaman* at (9,42).

**2 .** Bəzən ***"çox yaxşı", "əla"*** mənasında işlənir

Dedim axund, seyid, dərviş *yamandı*,
Mənim kimi axmaqlar da inandı
Hər *yaman* yer ki, olur-yaxşıların mənzilidir,
Ləl daş içrə, xəzinə dəxi viranə düşər (11,151).

Beləliklə, aydın olur ki, leksik yolla əmələ gələn eyni səs tərkibinə malik əks mənalı sözlər içərisində öz milli orijinallığı ilə dilimizin saflığını qoruyan fellər üstünlük təşkil edir. Həmin fellər dilimizin lüğət tərkibinin eyni səs kompleksinə malik əks mənalı sözlər hesabına zənginləşməsində xüsusi rol oynayır.

***Dialekt və şivələr hesabına yaranan enantiosemioya hadisəsi .***

Dilimizdə leksik yolla sözlərin yaranma üsullarından biri də dialekt və şivələr hesabına söz artımıdır. Ədəbi dilin lüğət tərkibinin zənginləşməsində dialekt və şivələrin xüsusi rolu vardır (10,435).

Dilimizin lüğət tərkibini dialekt və şivələr hesabına zənginləşdirən eyni səs tərkibinə malik əks mənalı sözlər aşağıdakılardır:

***Aba***

Enantiosemiya hadisəsi əsasında yaranan eyni səs tərkibli ***aba*** sözünün dialektoloji lüğətdə qeyd edilən: *ata* və *ana* əks mənalarına və onların işləndiyi nümunələrə nəzər yetirək:

***1. Ata*** (Gədəbəy, Quba, Ordubad, Zəngilan)

Bizdə hindi *aba* çox işdəmiyədü, ata diyəduğ (Quba)
*Abam* taxıl biçiydi (Zəngilan) (5,11).

***2. Ana*** (Cəbrayıl, Qax, Təbriz, Şəmkir)

*Abam* həmməşə bizi çox isdiyif (Şəmkir) (7,11).

***Adamcıl***

Eyni fonetik tərkibli ***adamcıl*** sözünün sözdaxili antonimlik yaradan: *insan qanına həris olan, vəhşi, adama hücum edən* (Şəmkir) və bu mənaya zidd *arif, qabil, adam tanıyan* əks mənaları və bu mənalara dair nümunələr aşağıdakılardır:

***1. İnsan qanına həris olan, vəhşi, adama hücum edən*** (Şəmkir)

Köpəyoğlu İrəməzanoğlu çox *adamcıl* adam oluf, nə qədər adam öldürüf (Şəmkir) (5,12).

***2. Arif, qabil adam tanıyan***

O kişi çox adamcıldı, ağzını açan kimi bilir, nə danışajaxsan (5,12).

***Xınız*** (Xanlar)

Sözdaxili antonimlik yaradan ***xınız*** sözü dilimizin leksikasını: *sirsaxlayan* və *paxıl, xəbis* əks mənaları ilə zənginləşdirir və aşağıdakı nümunələrdə hər iki mənada işlənir:

***1.Sirsaxlayan***

*Xınız* adam nə desən hesavı içəri verər, axıra da əlinən nəilsə elər (5,222).

***2. Paxıl, xəbis***

Həsən çox *xınız* adamdı (Kəlbəcər) (5,222).

***Qolay***

Lüğət tərkibini dialekt sözlər hesabına zənginləşdirən eyni fonetik tərkibli ***qolay*** sözünün: *pis* və *yaxşı* əks mənaları ilə bağlı nümunələrə diqqət yetirək:

***1. Pis*** (Biləsuvar, Kəlbəcər, Naxçıvan, Ordubad, Salyan, Yardımlı, Zaqatala, Zəngilan)

Bu yeri *qolay* suvarmısan (Naxçıvan)

Donumu illaf *qolay* tikiflər (Kəlbəcər)

**2. *Yaxşı*** (Başkeçid, Qax, Qazax, Zəngibasar, Şərur, Zəngilan)

Ma: licə bir az *qolay* eliyir (Şərur)

Qoluma qolaydı (5,307).

***Sıpıxmax***

Eyni səs tərkibli ***sıpıxmax*** sözü *kökəlmək* və *arıqlamaq* kimi əks mənalara malikdir. Aşağıda sözün hər iki mənasına dair nümunə verilir:

***1. Kökəlmək*** (Qafan)

Bu nə yaman *sıpıxıb*?(Qafan)

***2. Arıqlamaq*** (Zərdab)

Beləliklə, dialekt və şivələrimizdə eyni səs tərkibinə malik əks mənalı sözlərin varlığı və dilimizin lüğət tərkibinin inkişafında bu sözlərin xüsusi rola malik olması dilçilikdə enantiosemiya hadisəsinə təsadüfi yanaşılmanın yanlış olduğunu göstərir.

**Ədəbiyyat*:***

1.Azərbaycan dilinin izahlı lüğəti (I cild). Bakı: "Şərq-Qərb", 2006, 744 s.
2.Azərbaycan dilinin izahlı lüğəti (II cild). Bakı: "Şərq-Qərb", 2006, 792 s.
3.Azərbaycan dilinin izahlı lüğəti (III cild). Bakı: "Şərq-Qərb", 2006, 672 s.
4. Azərbaycan dilinin izahlı lüğəti (IV cild). Bakı: "Şərq-Qərb", 2006, 712 s.
5.Azərbaycan dilinin dialektoloji lüğəti.Bakı: "Şərq-Qərb",2007, 568 s.
6.Həsənov. H. Ə. Müasir Azərbaycan dilinin leksikası. Bakı: "Maarif",1987,308 s.
7. Xəlilov B.Ə. Azərbaycan dilinin leksikologiyası. Bakı:"Nurlan nəşriyyat", 2008, 442 s.
8.Məmmədov N.N. Azərbaycan dilçiliyinin nəzəri əsasları. Bakı: "Maarif", 1961, 1971, 367 s.
9. Məmmədov N.N. Azərbaycan dilçiliyinin nəzəri əsasları. Bakı: "Maarif", 1961, 367 s.
10.Qurbani. "Əsərləri". Bakı: " Şərq-Qərb", 2006, 232 s.
11.Qurbanov A.M. Müasir Azərbaycan ədəbi dili.I cild, Bakı: " Nurlan", 2003, 45 s.

**The lexical-semantic essence of the phenomenon of Enantiosemia**

**Summary**

Verbs protecting the purity of our Language prevail with their national originality in the event of enantiosemia arising from the lexical way(opposite meaningful words which have the same sound structure).The Same verbs play aspecial role in the enrichment at the expense of the opposite meamningful words which have thee same voice complex of our language dictionary content and are classifiedaccording to he ways of formation. Enantiosemia cases arising from the lexical way are much more thon borrowed

words.There are much more than borrowed words.There are much more opposite meaningful words enantiosemia having the same sound part in the Arabic language

**Лексико-семантическая сущность феномена энантиосемии**
**Резюме**

Энантиосемия – это образование слов с противоположенным значением, имеющие одинаковый звуковой состав. Среди них много национально-оригинальных глаголов, которые обеспечивают частоту нашего языка. Эти глаголы играют огромную роль в обогащении словарного запаса языка глаголами, антонимии, которые имеют одинаковый лексический состав. Они классифицируются по способу образованных лексическим путем больше, чем заимствованных слов. Среди заимствованных много арабских слов с одинаковым звуковым составом и противоположным значением.

**Rəyçilər: prof. B.Ə.Xəlilov,**
**f.e.d. M.N.Hüseynova**

**Sadıqova Nigar Firuz qızı**
Bakı Slavyan Universiteti

# AZƏRBAYCAN DİLİNDƏ RƏNGLƏRİN MƏNA ÇALARLARI

***Açar sözlər:*** *Azərbaycan dili, rənglər, metafora, ağ, qara, qırmızı*
***Key words:*** *Azerbaijani language, colours, metaphors, white, black, red*
***Ключевые слова:*** *азербайджанский язык, цвета, метафоры, белый, черный, красный*

Müasir dövrdə rəng anlamı demək olar ki, həm müxtəlif, həm də nisbi ola bilər. Əlbəttə, əsl rəng bildirən sifətləri bura aid etmirik. İstər Şərq, istərsə də qərbdə-bütün xalqların dilində "qırmızı", "qara", "yaşıl", "sarı", "göy", "ağ" eyni anlam daşıyır. Rəng çalarlarının adlandırılmasına gəldikdə isə hər bir dildə onlar mürəkkəb sistemə malik olurlar. Dunyada rəng çalarları artdıqca, dildə də müxtəlif rəng çalarlarının adlandırılmasına ehtiyac duyulur. Bu zaman bir predmetin rəngi digəri ilə müqayisə edilərək, bənzədilərək adlandırılır. Məsələn, gümüşü rəng., qəhvəyi rəng,bənövşəyi,narıncı və s.

Rəngin metaforik yol ilə dildə tez - tez işlənməsi nəticəsində o, dilin aktiv leksikasına daxil olaraq rənglər sistemini zənginləşdirir; narıncı, firuzəyi və s. Dildə rəng çalarlarının zənginliyi etnik mədəniyyətin xüsusiyyətlərindən, məişətindən, həyat tərzindən, şəraitindən də bəhrələnə bilər. İnsanların iş fəaliyyətindən asılı olaraq, solğun və ya əksinə, rəng çalarlarının bir dildə üstünlük təşkil etməsi qanunauyğunluq sayıla bilər. Qırmızı rəng azərbaycanlılar üçün toy - bayram rəmzidir. Toy günü el adətinə görə, qırmızı ipəkdən don geyər, qırmızı duvaq salar. Toy camaatı da geyimində al rəngə üstünlük verərlər; xonçalar al - əlvan parçalarla örtülər, gəlin cehizi qırmızı rənglərlə bəzədilər.

Azərbaycan nağıllarında şah qırmızı geyib taxta çıxar, fərmanlar verər. Cəza zamanı da şahlar qırmızı geyərdi. Deməli, xalqın psixologiyasında qırmızı rəng həm də idarəçilik, güc simvoludur.

"Ağ günə çıxasan", "Üzümüzü ağ elədin" kimi alqışlar da əsrlər boyu qan yaddaşımızda həkk olunub. Bu da ağa - işığa, günəşə - sarıya verilən üstünlükdür ki öz başlanğıcını Zərdüştlükdən almışdır.

Türk dünyasının böyük abidəsi Dədə Qorqud dastanında oğlu olanı ağ çadıra, qızı olanı qızılı çadıra, övladı olmayanı isə qara çadıra aparıb altına qara qoyunun dərisini salırlar.

Avropada ağ rəng bayram, təmizlik sülh simvolu olmuşdur. Avropasayağı ağ gəlin paltarı keçən əsrdən dəbdədir. Ağ göyərçinlər dünyada əmin - amanlıq, sülh mucəssəməsidirlər. Ağ bayraq çıxarmaq atəşkəs, təslim mənasında başa düşülür. Lakin ağ rəng hər yerdə, bütün millətlərdə eyni cür qarşılanmır. Hindistanda ağ rəng uzun əsrlərdir ki, matəm mərasimlərinin ayrılmaz atributuna çevrilmişdir.

Dillərin rəng sistemi zənginliyinə görə də bir - birindən fərqlənir. Bəzi dillərin leksik vahidləri az olduğuna görə onlar "kasıb" dillərə aid edilir. Belə hallarda rəngi digərindən fərqləndirmək üçün münasib söz tapılmır [3-5].

Rus və Avropa linqvistikasında rəng bildirən sifətlərlərin adlandırılması ilə əlaqədar problemlər barədə küllü miqdarda elmi işlər yazılmaqdadır. Tədqiqatçılar rəng adlarının miqdarını fərqli olaraq təyin edirlər. Rus alimi Şemyakin F.N. yazır: «Количество цветов, которые человеческий глаз способен различить в предметах, определяется разными исследователями в пределах примерно от пятисот тысяч до двух с половиной миллионов» [3-5].

J.Aqoston isə qeyd edir ki, insanın gözü iki yüzə qədər rəng çalarını fərqləndirə bilər [4-21].

Azərbaycan və rus dilinin rəng sistemini leksik - semantik cəhətdən müqayisə etsək, fərqli və oxşar cəhətləri taparıq. Məsələn:

Şabalıdı - каштановый
bənövşəyi - фиалетовый
narıncı - апельсиновый
firuzəyi - бирюзовый
fil sümüyü rəngi - цвет слоновый кости
sədəf rəngi - перламутровый
gümüşü - серебренный
zümrüd rəngi - изумрудный
yaqut rəngi - рубиновый цвет
asvalt rəngi - асфальтный
qəhvəyi - кофейный
kəhrəba rəngi - янтарный

Həm rus, həm də Azərbaycan dilində rənglərin düzülüşü sifətin keyfiyyət dərəcəsindən asılı olaraq dəyişir. Rus dilində də rənglərin çoxu öz başlanğıcını bitkilərdən alır: Buğda - buğdayı (пшено - пшеничный), lalə - lalə rəngi (мак -маковый), saman - saman rəngi (солома - соломенный), xurma - xurma rəngi (хурма - хурмовый), mixək - mixəyi (гвоздика - цвет гвоздики), darçın - darçını (корица - цвет корицы), püstə-püstəyi (фисташка - фисташковый), şabalıd - şabalıdı (каштан - каштановый), zeytun - zeytuni (олива - оливковый) və s.

"Вишневый, василковый, малиновый, гранатовый, табачный, соломенный, сиреневый, фисташковый, абрикосовый" kimi rənglər rus dilində çox işlənir. Hər iki dildə əsas rənglər xüsusi yer tutur. Bunlara daxildir: qırmızı, sarı, yaşıl, mavi, göy, ağ, qara, boz . «Qəhvəyi - коричневый» rəngdən başqa bütün rənglər üst - üstə düşür.

Sifətin sintaktik yol ilə azaltma və çoxaltma dərəcəsində olan rənglər də bitkilərə istinad olunaraq, leksikamızda işlənirlər, məs:

Tünd - narıncı, tünd - qəhvəyi, tünd - buğdayı, tünd - şabalıdı, tünd - xurmayı və s. Morfoloji yol ilə düzələn çoxaltma dərəcəsində obyekt bildiren rənglər iştirak etmir. Əsas rənglər bu vəzifəni özləri daşıyırlar: sarı - sapsarı, göy - gömgöy, yaşıl - yamyaşıl və s.

Sifətin azaltma dərəcəsində rəng bildirən sifətlər sintaktik yol ilə bitki rənglərinin alınmasında iştirak edirlər: açıq - narıncı, açıq - qəhvəyi, açıq - sürməyi, acıq - şabalıdı. Lakin bunu bütün obyekt bildirən rənglərə şamil etmək düzgün deyil. Morfoloji yolla düzələn azaltma dərəcəsində əsl rəng bildirənlər iştirak edir, məs: goyümsov, qırmızımtraq, ağımtıl, qaramtıl və s.

Əsas rənglər istisna olmaqla, qalanları "rəng" sözü əlavə edilmədən müstəqil şəkildə mənanı ifadə edə bilmir, amma təşbeh kimi mustəqil işlənə bilər, məs: "yanaqları lalədir, gözləri kömür, gözləri zümrüd, firuzə, saçları qətran, dişləri sədəf, üzü fil sümuyü" və s.

Azərbaycan dilində əsas rənglər yalnız rəng bildirməklə kifayətlənmirlər, məcazi məna yaratmaqla leksikamızı zənginləşməsində rol oynayırlar:

I. "ağ" təmiz mənası verir. Çimib ağappaq oldu. Paltarlar ağardı.

II. "ağ yalan", "qaranın üzərinə ağla getmək" kimi məcazi məna kəsb edir.

III. "ağciyər"- vasvası, "ağsaqqal", "ağbirçək" - yaşlı, qoca mənasında işlənir.

VI. ağını çıxarmaq – ağ eləmək

V. Ağ günə çıxmaq.

VI.Ağqvardiyaçılar – rus çarının qoşunu

"Qara" əsas rəng olmaqla müxtəlif semantikası ilə fərqlənir.

I.Əllərim qaralıb, rəngini dəyişib.

II. Ağ yudum, qara sərdim: yəni çirkli qaldı.

III. Qarabağ, - "qara" böyük mənasındadır.

IV. qara böhtan – çirkab mənasındadır.

V. "Qara yaxmaq" məcazi mənada böhtan atmaq

VI. qara camaat - sadə camaat

VII. qara qüvvələr - pis, düşmən mənasındadır.

VIII. Gözləri qaraldı

IX. Ağı gedib, qarası qalıb.

X. Gözünün ağı - qarası bircə oğlu var.

"Qara xəbər, qara kağız, qara geymək, qaragün olmaq" kimi məcazi məna daşıyan sözlər rəng baxımından Azərbaycan dilinin semantikasında baş verən dəyişikliklərin nəticəsidir.

Qırmızı rəngin dildə işlənmə imkanlarını izləyək:

I. Qıpqırmızı olmaq - pərt olmaq mənasında

II. qırmızısifət - utanmaz mənasında

III.Qırmızı - qırmızı üzümə durdu.

VI.Qırmızılar – XX əsrdə qırmızı qvardiya adlanırdı.

I. Göy çəmən - yaşıl mənasında

II. göyərmək - omonim kimi - 1. soyuqdan;

III. göyərmək - cücərmək mənasında

IV. Yeri göyərdi - gömgöy oldu.

Misallardan aydın olur ki, rənglər nitq hissələrinin yaranmasında, substantivləşmələrdə, mürəkkəb söz yaranışında komponentlərdən biri kimi çıxış edə bilirlər və nəticədə leksika çoxşaxəli dil vahidləri ilə zənginləşmiş olur.

Söz birləşmələrində və mürəkkəb sözlərdə semantik dəyişiklik rəng bildirənlərin quruluşuna çox təsir edir. Buna gorə də bu qisim sözlərin tədqiqi həm nəzəri, həm də praktik əhəmiyyət daşıyır. Dərs vəsaitlərində, metodik vəsaitlərdə bunu nəzərə almaq mütləqdir.

**Ədəbiyyat:**

1.Cəlilov F. Azərbaycan dilinin morfonologiyası.Bakı, Maarif, 1988.
2.Cəfərov Q. Azərbaycan dilinin leksik - semantik sistemi. Bakı, Elm,1984.
3.Шемякин Ф.Н. Цвет и его название. Изв Акад. пед. наук РСФР, вып.113.М.,1960.
4.Агостон Ж. Теория цвета и ее применение в искусстве в дизайне. М.,1982.

**Meaning of colour ranges in azerbaijani language**
**Summary**

The color classification is widely used in the azerbaijani language. Some colors are borrowed from the names of plants. This enriched the color system of the azerbaijani language.

The article identifies metaphors created by white, red, and black colors. In addition, comparative analogies have been made in Russian.

**Значение цветовых гамм на азербайджанском языке**
**Резюме**

На азербайджанском языке широко применяется классификация цветообразования. Некоторые цвета позаимствованы от названий растений. Это обогатило цветогамную систему азербайджанского языка.

В статье указаны метафоры, создаваемые белым, красным и черными цветами. Кроме того, на русском языке проведены сравнительные аналогии.

**Rəyçi: dos.A.Məmmədova**

**Керимова Леся Александровна**
Бакинский славянский университет

# ИСТОРИЯ ПОЯВЛЕНИЯ ТЮРКИЗМОВ В СОВРЕМЕННОМ УКРАИНСКОМ ЯЗЫКЕ

***Ключевые слова**: история, заимствования, тюркизм, периодизация, взаимодействие*
***Açar sözlər:** tarix, alınmalar, turkizmlər, mərhələlilik, qarşılıqlı əlaqə*
***Key words:** history, receipts, Turkisms, phonetics, mutual relations*

Лексика каждого языка складывается в процессе ее продолжительного исторического развития.

Термина «чистый язык в мире не существует. Любой язык мира, в большей или меньшей степени, впоследствии исторических, политических, экономических перемен подвергается изменению. То есть, в лексический состав языка входят новые слова из других языков.

Экономико-географическое положение Украины является примером того, что в разные исторические периоды славянские племена, жившие на территории современной Украины, тесно контактировали с тюркскими племенами.

Тюркские племена оставили заметный след в лексике восточно–славянских языков – украинского, белорусского, русского, а также оказали некоторое влияние на фразеологию и грамматику этих языков.

Прибегнем к следующей периодизации, чтобы проследить взаимодействие славянских и тюркских языков:

1. I-VIII век н.э. до образования Киевской Руси, когда начались более тесные языковые связи восточных славян с тюркскими, финно-угорскими и иранскими племенами.
2. IX-XII вв. период Киевской Руси характеризуется уже более тесными связями и взаимодействием славянских языков сначала с языками тюркских племенных союзов печенегов, огузских племен узов, торков, берендеев, ковуев и др., а несколько позже с языком половцев, влияние которых на лексику было значительным.
3. XIII-XV вв. период монгольского нашествия, который характеризуется широким проникновением в украинскую лексику тюркских, кыпчакских диалектов и в меньшей степени монгольских слов.
4. XVII- XIX вв. – постоянные войны с Турцией.
5. Период – после Октябрьской революции, когда языковые связи между славянскими и тюркскими народами приобрели иной характер, а именно в рамках одного государства.

Украинская лексика, как и язык в целом, тесно связана с историей украинского народа. Некоторые слова уходят в прошлое, некоторые появляются с развитием науки, техники, искусства. Из-за превратности исторической судьбы и в процессе своего культурного развития, украинский народ заимствовал немалое количество тюркских слов. Большое количество заимствований тюркских слов украинским языком приходится в основном на период XII – XVII вв., в связи с усилением торговых, сельскохозяйственных и военных контактов славян с тюркоязычным миром. Украинский язык испытывал непосредственное влияние тюркских языков из-за географического положения и близости с местом компактного проживания тюрков (Южный и Северный Кавказ, Турция, Болгария и т.д.)

Тюркизмы в украинском языке можно разделить на две группы:

- Тюркизмы, перешедшие в украинский язык посредством общеславянских или других языков.
- Тюркизмы, перешедшие непосредственно с тюркских языков.

В украинской лексике, наряду с тюркскими словами, имеются и слова, перешедшие из других восточных языков (арабского и персидского). Основываясь на исторических фактах, известно, что Украина никогда не подвергалась нашествию арабских и персидских племен. Тем не менее мы наблюдаем их наличие в украинской лексике. Значит, роль языка посредника в заимствовании украинским языком арабских и персидских слов принадлежит тюркским языкам, так как тюркские племена были в непосредственном контакте с вышеуказанными народами. Позаимствовав слова из арабского и персидского языков, тюркские племена передавали их и другим народам (они, как известно, были кочевыми племенами). Много слов были связаны с религией (в частности, с исламом: *імам, мінарет, муджахід, джихад, азан, іслам, муфтій, мечеть, намаз, паранджа, рамазан* и т.д.), государственными чинами, административным делением, бытом (*меджліс, азимут, алгебра, аманат, бедуїн, візир, газель, дервіш, джин, емір, еліксир, мумія, факір, шайтан, яшма* и т. д.)

Состав тюркизмов украинского языка частично совпадает с тюркизмами русского и белорусского языков. Например, общими являются следующие слова:

«А» - ахтагель, аркан, атлас

«Б» - *бергамот, башлик, базар, бей, бек, беркут, бешмет, буза, буланий, бурдюк , барабан, боярин, баклажан и т. д.*

«В» - *вишня, в'юк, ватага.*

«Д» - *диван.*

«Г» - *гайдамак, гяур, гайда*

«І» - *ішак, інжир.*

«К» - *кабарга, козак, казна, каракуль, карга, каторга, каюк, кибитка, кизил, кізяк, кинджал, кумис, курага, курган, ковбаса, кабан, каланча и т.д.*

«О» - *орда.*

«П» - *папаха, парча, паша.*

«С» - *сазан, сайга, саксаул, саман, судак, султан, сургуч, сурма, сарай.*

«Т» - *табун, таз, товар, туман, торба, туша, тюбетейка.*

«Ф» - *феска.*

«Х» - *халат, халва, хурма.*

«Ч» - *чекан, чалма.*

«Ш» - шашлик, шалаш, *шайтан, шатер.*

«Я» - *ярлик, ятаган, ясак и т.д.*

Как мы видим , большинство вышеуказанных примеров относятся либо к сельскому хозяйству, либо к военному делу. То есть то, чем в основном занимались тюркские племена, которые были в непосредственном контакте с украинцами.

В украинском языке тюркизмы можно распределить по 12 семантическим группам:

*1.* Природа, минералы, растения, животные: *алмаз, алича, кавун, лелека, гарбуз, шакал, борсук, ізюм.*
2. Хозяйство, домашний обиход: *килим, баштан, мангал, сундук, дарах, бахча.*
3. Ремесло, торговля, деньги, меры: *чабан, килимник, каган, візир, терези, гак.*
4. Строительство, постройки: *юрта, караван-сарай, мечеть, мінарет.*
5. Одежда: *башмак, кафтан, паранджа, тулуб, чадра, шаровари.*
6. Блюда, напитки: *айран, чурек, лаваш, бешбармак, кумис.*
7. Игры, музыкальные инструменты: *зурна, дутар, саз.*
8. Тело, лекарства: *кадик, ясак, башибузук.*
9. Личность, общество, вера, народ: *Аллах, байрам, імам, мурза, паша, ватага.*
10. Административно-судебное дело: *шаріат, каторга, караул, хаджі.*
11. Военное дело: *мішень, ватаг, чата, отаман, козак.*
12. Разные значения: *тютюн, майдан, ашуг, сабантуй.*

Тюркизмы в украинском языке встречаются во многих литературных произведениях украинских авторов, в частности «Слове о полку Игореве». Сюда входят слова тюркского происхождения, попавшие в украинскую лексику во время татарского нашествия (XIII- XIV вв.). Позже в произведениях Т.Шевченко, И.Нечуй-Левицкого, крымском цикле новелл М.Коцюбинского, стихах Леси Украинки. Во второй половине двадцатого века писатели обращаются к исторической тематике, поэтому в их произведениях отражены княжеские и казацкие времена, а также прослеживается взаимодействие украинцев с тюркоязычным населением.

Особенно отчетливо прослеживаются тюркизмы в исторических песнях и думах - жанрах украинского народного творчества. Они присущи только украинской национальной культуре. Появление украинских дум ученые исследователи связывают с казачеством. Борьба казаков с завоевателями-турками, татарами, жизнь пленников в турецкой неволе, тяжелый их быт на галерах, морские походы казаков, - все эти события были мотивами украинских дум.

Тюркизмы входили в украинский язык, как правило, через устную разговорную речь, и поэтому сегодня не воспринимаются как иноязычный элемент.

Считается, что в современном украинском языке насчитывается около 4000 тюркизмов, половина из которых являются общеупотребляемыми, а остальные представляют собой историзмы, диалектизмы и экзотизмы. В процессе освоения тюркизмов украинским языком в одних случаях заимствования сохранили фонетическую и семантическую идентичность или похожесть с языком источника, в других случаях произошли морфологические изменения внешней формы без трансформации семантики или же произо-

шли семантические смещения без изменений морфологии. Все это соответствует закономерностям освоения элементов одного языка другим.

**Литература:**

1. « Етимологічний словник української мови» Київ 2001.
2. Халимененко Т.І. «Тюркізми в термінології стратегії й практики війська запорозького». Київ 1992.
3. Д.І. Яворницький «Словник української мови» 1920.
4. М.Т. Рильський стаття « Про іноземні слова» Київ, 1930
5. О.С. Мельничук «Етимологічний словник української мови» Київ: Наукова думка, 2012. 568с.
6. Чолакова А.Д. «Функционирование тюркизмов в украинском языке» Харьков. 2009, 40 с.

**Ukrayna dilinə turkizmələrin daxil olma tarixi**
**Xülasə**

Müasir Ukrayna dili xalqın tarixi inkişaf yolu ilə sıx bağlıdır. Tarixən Ukrayna dilini daha çox turk dilləri zənginləşdirib. Turk dilindən alınmalar əsasən şifahi danışıq dili vasitəsi ilə ukrayın dilinə daxil olmuşdur. Buna görə turkizmlərə əsasən folklor numunələrində rast gəlinir. Turkizmlər Ukrayna dilinə orqanik şəkildə daxil olmuş və bu gün onlar bu dildə kənar bir element kimi qəbul olunmur. Müasir ukrayın dilində təxminən 4000 turkizm var. Onların yarısı umumi istifadə olunan sözlərdir. Digərləri isə dilin xususi leksikası kimi mövcuddur. Turkizmlər bəzi hallarda olduğu kimi transfarmasiya olunub. Lakin ciddi morfoloji, fonetik ve semantik transformasiyalar da müşahidə olunur.

**History of the introduction of turkism in the Ukrainian language**
**Summary**

Modern Ukrainian language is closely linked to the history of Ukrainian people's development. Historically, the Ukrainian language has been enriched by more Turkish languages. The receipts from the Turkish language were mainly translated into the Ukrainian language through the spoken language. Therefore, Turkisms are found mostly in folklore samples. The Turkisms have entered the Ukrainian language organically and today they are not regarded as an outsider in this language. Modern Ukrainian language has about 4000 Turks. Half of them are commonly used words. Others have the same language as the lexicon. In some cases, transcripts have been transplanted. However, serious morphological, phonetic and semantic transformations are also observed.

**Rəyçi: dos. Q.Ağa-zadə**

**Əhmədova Səidə Məhiyəddin qızı**
N.H.Cəbiyev adına tam orta məktəb (Yardımlı r-nu)
seide-86@mail.ru

# İNGİLİS DİLİNDƏ MÖVCUD OLAN HAZIR BİRLƏŞMƏLƏRİN TƏSNİFATI

***Açar sözlər:*** *frazeologiya, birləşmə, idiom, məsəllər, təsnifat*
***Key words:*** *phraseology, combinations, idiom, sayings, classification*
***Ключевые слова:*** *фразеология, сочетания, идиома, поговорки, классификация*

Dildə çoxlu sayda söz və ifadələr mövcuddur. Bütün dillərdə olduğu kimi ingilis dilinin de özünə məxsus sabit və sərbəst söz birləşmələri, idiomlar, atalar sözləri və məsəlləri mövcuddur. Dildəki sabit birləşmələr dilin əsas frazeoloji birləşməsini təşkil edir. İngilis dilində frazeoloji birləşmələrin bəzilərində komponent əksikliyi olarkən, bəzilərində hissələrin sabitliyi görünür. Bu ifadərin mənalarını bəzən bir başa anlamaq çətin olur. Ona görə də dilçilikdə bu ifadələrə aydınlıq gətirmək zəruri və aktual məsələlərdəndir.Hazır ifadələr müəyyən şərait və mətn daxilində anlaşılır və ya hazır şəkildə öyrənilir. Buna aid bəzi birləşmələrə nəzər salaq.

A dark horse-qara at (haqqında heç nə bilinməyən insan)

A white elephant-ağ fil (pul israfı)

Green-eyed monster-yaşıl gözlü şeytan( qısqanc mənasında Otello əsərindən götürülüb)

To let the cat out of the bag-bişiyi çantadan çıxarmaq( sirrin açılması)

To bark up the wrong tree- səhv ağaca hürmək( yalnış yerdə axtarmaq)

Xarici dil öyrənənlər, xüsusən, az yaşlılar bu ifadələrə xüsusi diqqət yetirməlidir, çünki bu birləşmələri düzgün yerində işlətməmək müəyyən anlaşılmazlıqlara səbəb ola bilər. Məsələn balaca Cim və anası arasında gedən kiçik dialoq buna misal olaraq göstərilə bilər.

Jim: Mum, Tom is dead. (Ana,Tom ölüdür)

Mum: Nonsense, child. He phoned me 5 minutes ago.(Cəfəngiyyatdır, övladım. O, 5 dəqiqə əvvəl zəng etmişdir.)

Jim: But I heard Mrs. Brown said her neighbours cut him dead. (Amma mən eşitdim xanım Braun dedi ki, qonşular onu ölü kəsib).

Sonuncu cümləni olduğu kimi tərcümə etsək, Tomun öldüyü anlaşılar. Lakin *cut her dead* ifadəsi onu *görməzdən gəlmək* mənasında işlənir.

İngilis dilində mövcud olan hazır birləşmələrin bir qismi də idiomlardır ki, nitqdə onların da rolu böyükdür və ingilis dilinin leksikasının çox hissəsini təşkil edir. İngilis idiomları kitabının müəllifi Kollins bildirir ki, bu gün standart danışıq dili və yazılı dildə çox sayda idiomlar yaranır və dilin əsasını təşkil edir. İdiomlar adətən bütov bir fikri əhatə edir. Məsələn, *to drop a brick(kərpici yerə salmaq)-gözlənilməz söz demək*[1]. Bu cür ifadələrin olması əslində dilin zənginliyini göstərir və nitqini ifadəli və dolğun etmək istəyənlər belə ifadələrin öyrənməsinə xüsusi diqqət yetirməlidirlər. Hətta ingilis dili biliyinin standart səviyyəsini ölçən İELTS və TOEFL kimi imtahanlarda da idiom və frazeoloji birləşmələri düzgün yerində işlədənlər daha yüksək bal ilə qiymətləndirilir. Lakin bütün bunlara baxmayaraq nitqdə idiomlara çox yer verdikcə danışanın çıxışı öz orijinallığını itirə bilər və nəzərə alsaq ki, idiomlar dildə olan hazır elementlərdir, o zaman danışan təkrarçılığa yol vermiş olar. İdiomlar bəzən frazeoloji birləşmələrlə eyniləşdirilə bilər, lakin idiom frazeoloji birləşmələrin tərkibinə daxil olan hazır ifadələrdir. İdiomlar bəzən ifadələr toplusu, frazalar(ifadələr), sabit söz qrupları, birləşmələr və s.kimi də adlandırılır. Dilə daxil olan digər birləşmələr sərbəst söz birləşmələridir. Onların hissələri heterogen olaraq çoxalır, artır və dəyişə bilir.Əslində dildə olan sərbəst söz birləşmələri tam mənası ilə sərbəst də sayılmaz. Belə ki, o öz birləşdiyi sözlə belə həmin an müəyyən qaydalara tabe olmalı olur. Məsələn, *qara gözlü qız* deyərkən, *qara gözlü stol* ifadəsi yalnış olardı. Burada məna ilə yanaşı qrammatik əlaqə də düzgün işlədilməlidir. Bəzən sərbəst söz birləşmələri və frazeoloji birləşmələr arasında da sərhədi müəyyən etmək çətin olur. Sərbəst söz birləşmələrinin üzvləri leksik və sintaktik cəhətdən müəyyən sərbəstliyə nail olarkən, frazeoloji birləşmələrə bu azadlığı şamil etmək olmaz. Ümumiyyətlə söz qrupları və frazeoloji birləşmələr arasında fərqlər mövcuddur. Əsasən frazeoloji birləşmənin ayrıla bilməyən hissəsi həmin ifadənin aparıcı mənasını daşıyır. Lakin məna düzgün anlaşılmalıdır. Məsələn, *stew in one's own juice (öz axmaqlığından əziyyət çəkmək).* Qeyd olunduğu kimi belə ifadələr anlaşıla bilən mətn daxilində və düzgün şəraitdə işlədilməlidir. Belə ifadələr əsərlərdə daha çox mətn daxili vəziyyətə uyğun işlədilir.

Frazeoloji birləşmələr özü isə semantik, struktur cəhətdən fərqli olar bilər. Akademik V.V.Vinoqrodovun semantik təsnifatına əsasən frazeoloji birləşmələr aşağıdakılardır:

1.Frazeoloji uyuşmalar hissələrindən biri məna dəyişikliyi edə bilər və ilk baxışda gizli mənanı anlamaq lazımdır. A.Smith onları idiom kimi qələmə verirdi.

red tape-qirmizi maqnitafon-(bürokratizm mənasında)

2.Frazeoloji birləşmələr öz mənasını və hissələrini qoruyur və ifadənin mənası hissələrdən anlaşılır.

To show one's teeth-dişini göstərmək(qeyri səmimi olmaq mənasında)

3.Frazeoloji qovuşmalar isə nəinki mənasını hissələrdən alır, hətta hissələrdən biri bir başa öz mənasında işlənə bilər.

To attain success-uğur qazanmaq.

Frazeoloji birləşmələrin digər bölgüsü A.İ. Smirnitski tərəfindən quruluşa görə irəli sürülən struktur təsnifatıdır. Onun fikrincə sözlərin ekvivalenti kimi götürülən *yüksək idiomatik* ifadələr aşağıdakı qrupa bölünür.

1.Ənənəvi ifadələr(nice distinction-gözəl fərqlilik)

2 Frazeoloji birləşmələr (to fall in love-eşqə düşmək)

3.idiomlar (to wash one's dirty linen in public-ictimai yerdə bir kəsin kirli çamaşırlarını yumaq-(sirr açmaq mənasında)

A.İ.Smirnitski ikinci qrupa aid edilən frazeoloji birləmələrin özünü iki qrupa ayırmışdır.

a) Düzəltmə sözlərlə müqayisə edilən bir zirvəli ifadələr- to bring up(tərbiyə etmək)

b) Mürəkkəb sözlərlə müqayisə edilən iki zirvəli ifadələr- take place(baş vermək)[2].

İngilis dilində mövcud olan hazır birləşmələrlə bağlı digər təsnifat A.V.Kuninə xasdır.

Onun fikrinə əsasən frazeoloji birləşmələr mənalarını qismən və ya tamamən köçürmüş sabit söz birləşmələridir.A.Kuninin struktural-semantik təsnifatı isə aşağıdakı bölgüyə əsaslanırdı:

a) leksik- a skeleton in the cupboard-dolabda sklet(ailə sirri mənasında)

b)qrammatik-to be in deep water-dərin suda olmaq(çətin vəziyyətdə olmaq mənasında)

c) vəziyyət- a square peg in a round hole-yumru dəlikdə dördkünc yiv(bolt)-(qabiliyyətinə uyğun yerdə olmamaq)

d) qarışıq variantlar[3].

Dildə mövcud olan sabit fikir və ifadələrdən bir qismi də atalar sözləri və məsəllərdir. Atalar sözləri hər kəs tərəfindən anlaşılan ümumi gerçəklikləri ifadə edir və eyni zamanda şəraitə uyğun olaraq, ruh yüksəkliyi yaratmaq, əxlaqi və nəsihətamiz məsləhətlər vermək, xəbərdarlıq etmək və tənqid etmək kimi fərqli funksiyaları yerinə yetirir.

Məsələn:"Silence is something an answer" Susmaq özü də bir cavabdır [4]. Verilən nümunədən də aydın olduğu kimi, cümlədən ibrətamiz nəticə çıxarmaq olur və atalar sözlərində metaforiyaya daha geniş yer verilir.

Məsəllər və ya digər adı deyimlər (sayings) olan hazır ifadə növləri də atalar sözləri kimi anlaşılır, lakin onların arxasında kiçik nəsihətamiz hekayələr dayanır.

Məsələn:"Little drops make the mighty ocean".-Kiçik damcılar qüdrətli okeanı yaradır.(Dama-dama göl olar mənasında)

Nəticədə verilən misallardan da aydın olur ki, bu ifadələrin bəziləri dilimizə bir başa tərcümə olunursa, bəziləri də ifadələrin qarşılığını dəqiq yerinə yetirə bilmir. Bu zaman həmin ifadələr tərcümə olunan dilin tərkibindəki uyğun ifadələrlə əvəz edilməlidir. Belə birləşmələrdə bəzən həmin dilə xas olan adət və ənənələr, milli düşüncələr, xalqa xas ifadələr də öz əksini tapır. Beləliklə də, bu ifadələrin mətndaxili və daha geniş izahata ehtiyacı olur.

## Ədəbiyyat:

1. Cowie, Anthony P/Mackin, Ronald/Mc Caig, IR. Oxford Dictionary of Current Idiomatic English,2005
2. www.studopedia.su
3. Кунин А.В.Англиская фразеология "Высшая школа",1970,с 343
4. W.G.Smith.The Oxford Dictionary of English Proverbs

## The classification of the ready-made combinations in the English language

**Summary**

There are different fixed word combinations in the English language. They are phraseological units, idioms, proverbs, sayings that transfer or hide their meanings. Sometimes listeners or readers don't understand them directly, so contextual relations and meanings help them to understand. These word groups are classified for their lexic-semantic, and grammatic functions by V.Vinogrodov, A. Koonin, A.Smirnitsky. These idioms and phrases make a speaker's speech rich but they shouldn't be used often because the text can lose its originality. Sometimes idioms are mixed with phraseology. But we should know that idioms are also parts of phraseological units.

## Классификация устойчивых словосочетаний в английском языке

**Резюме**

В английском языке есть различные устойчивые словосочетания. Это фразеологические единицы, идиомы, пословицы, поговорки, которые передают или скрывают их значения. Чтоб определить их точное значение важен контекст, в котором они использованы. Контекст определяет их смысловую нагрузку. Они обогащают и разнообразят речь, но их обилие в тексте также усложняет восприятие текста.

Устойчивые словосочетания занимают важное место среди фразеологизмов. Они были изучены В.В.Виноградовым, А. Куниным, А.Смирнитским др. учеными.

**Рецензент: преп. Э.С.Умудова**

**Керимова Леся Александровна**
Бакинский славянский университет

# СТАНОВЛЕНИЕ И РАЗВИТИЕ ФРАЗЕОЛОГИЧЕСКОЙ НАУКИ В УКРАИНЕ

***Ключевые слова***: *фразеологизмы, развитие, периоды, культура, традиции, особенности*
***Açar sözlər***: *frazeologizmlər, inkişaf, mərhələlər, mədəniyyət, ənənənə, xüsusiyyətlər*
***Key words:*** *frazeologisms, development, stages, culture, tradition, features*

Фразеологизмы относятся к языковым единицам, дающим представление об истории, культуре, мировоззрении и образе жизни украинского народа. Фразеологические единицы делают речь более выразительной, яркой и свидетельствуют об уровне развития языка. Богатство состава фразеологических единиц в лексической системе украинского языка дает возможность их изучения в различных аспектах (этимологическом, семантическом, синтаксическом и т.д.).

Во фразеологических единицах находит отражение мировоззрение украинского народа – система взглядов, оценок и образных представлений о мире и месте в нем человека, общее отношение человека к окружающей действительности и самому себе, а также обусловленные этими взглядами основные жизненные позиции людей, их убеждения, идеалы, принципы познания и деятельности, ценностные ориентации. Такие внеязыковые факторы, как украинские обычаи, обряды, традиции, верования и т.д., являясь неотъемлемой частью духовной культуры украинского народа и выражая его мироощущение в разные периоды исторического развития, тесно связаны с появлением отдельных фразеологических единиц.

Определение фразеологического фонда современного украинского языка, уточнение принципов отграничения фразеологических сочетаний слов от устойчивых словосочетаний нефразеологического типа стало возможным в результате развития как общей теории фразеологии, так и национальной (украинской) фразеологии.

Процесс становления украинской фразеологии как новой лингвистической дисциплины глубоко и всесторонне описан в трудах Ф.П.Медведева, Н.А.Москаленко, Л.Г.Скрипник, А.С. Юрченко и др.

В истории изучения украинской фразеологии условно можно выделить три периода: 1) первый – подготовительный (50 – 60-е годы XX в.) – обоснование основных понятий фразеологии, описание стилистического использования фразеологизмов в художественных текстах и т. д., 2) второй – период структурно-семантического описания фразеологии (70 – 80-е годы XX в.) – систематизация фразеологического материала по структуре, семантике, грамматическим и стилистическим параметрам, 3) третий – период функционального изучения фразеологии (90-е годы XX в. – XXI в.) – комплексное исследование фразеологии в прагматическом, культурологическом, идеографическом и других аспектах с привлечением достижений наук, исследующих человеческий феномен. Рассмотрим более подробно эти периоды в развитии украинской фразеологии.

1. 50 – 60-х годы XX в. считаются подготовительным этапом в становлении украинской фразеологии потому, что она, как наука, именно в это время начала развиваться на украинской языковой почве. Первой фразеологической работой в Украине была книга Чередниченко І. Г. «Нариси з української фразеології (з російсько-українськими паралелями): Прийменникові конструкції. К., 1952. Ч. 1, которая имела нормативно-справочное назначение. В этом издании были рассмотрены важные факты и явления украинской фразеологии в сравнении с русскими.

В 50-х годах XX в. фразеология украинского языка становится объектом исследования в кандидатских диссертациях (Л.Г. Скрипник, Н.М. Богдан, Л. И.Добржанской и др.). В то же время начинают появляться первые публикации в научных всеукраинских изданиях «Мовознавство» и «Українська мова в школі», например, работы И.К.Белодида, Н.А. Крыжановской, В.А.Шадуры и других. Эти исследования посвящены стилистическому использованию фразеологических единиц в творчестве отдельных писателей или в отдельных произведениях.

Со II пол. 50-х годов XX в. статьи об украинской фразеологии начинают печататься и в региональных сборниках научных трудов. Среди них следует назвать исследования Г.М.Удовиченко, М.М. Богдана, М.С.Тофана и др.

Таким образом, в 50-е годы XX века ФЕ, которые в украинской фразеологии чаще понимаются в широком значении, изучаются, как правило, или на материале художественной литературы, или параллельно с лексикой.

К концу 50-х годов XX в. относятся первые попытки систематизации украинского фразеологического материала в специальных словарях. Первым фразеологическим словарем, который увидел

свет в Украине, был словарь переводного типа – «Фразеологічний словник англійської мови з українськими відповідниками» К.Т.Баранцева, в котором насчитывалось около 7 тыс. устойчивых выражений.

В 60-х годах XX в. в журнале «Українська мова і література» появляются труды украинских ученых (Г.М.Мукан, Н.А.Москаленко, О.М.Масюкевич, М.А.Грицак), в которых исследуются основные понятия фразеологии и термины, которые их обозначают; компонентный состав; грамматические особенности ФЕ; основы фразеографии и др.

Во второй пол. 60-х годов XX в. происходит становление двух направлений в украинской фразеографической практике: 1) создание работ учебно-методического характера, 2) составление толковых фразеологических словарей. У истоков обоих направлений стояла Н. А. Батюк – автор словаря «Фразеологічний словник». В нем дается толкование наиболее распространенных ФЕ, зафиксированных в украинских художественных произведениях, изучаемых в средней школе.

2. Начало 70-х годов XX в. характеризуется не только ростом числа фразеографичеких изданий в Украине, но и совершенствованием принципов их создания, появлением новых типов словарей. В 1971 г. издан «Украинско-русский и русско-украинский фразеологический словарь» И. С. Олейника и М. М. Сидоренко, в котором в алфавитном порядке подается 7 тыс. украинских и 6,5 тыс. русских ФЕ с лексико-грамматическими вариантами, указанием на функционально-стилистическое и эмоционально-оценочное значение.

В конце 60 – нач. 70-х годов XX века в Харьковском университете под руководством проф. Ф.П. Медведева начал формироваться первый в Украине научный центр по проблемам изучения украинской фразеологии. Кроме работ самого проф. Ф.П. Медведева, стали появляться труды его учеников, в том числе и кандидатские диссертации.

3. Третий период в истории изучения фразеологии в Украине совпадает с обретением Украиной независимости – началом 90-х годов. С 1991 г. начинается комплексное исследование фразеологии в прагматическом, культурологическом, идеографическом и других аспектах с привлечением достижений наук, исследующих человеческий феномен. В это время увидела свет монографии Ю. Ф. Прадида «Фразеологічна ідеографія (проблематика досліджень)» и др.

В 90-е годы XX в. заметных успехов достигла в Украине фразеография. Возникла необходимость и в создании словарей индивидуально-авторского использования ФЕ, которые помогают выявить сложный процесс взаимодействия узуального и окказионального в сфере фразеологии, зафиксировать различные приемы индивидуально-авторских изменений ФЕ относительно языковой нормы. Достижения в теории и практике фразеографии конца XX в. создали предпосылки для подготовки тематических фразеологических словарей. В 1994 г. в Украине появилась первая фразеографическая работа, построенная по тематико-идеографическому принципу – «Русско-украинский и украинско-русский фразеологический тематический словарь: Эмоции человека» Ю. Ф.Прадида. Следует подчеркнуть, что этот словарь принадлежит к словарям комбинированного типа, потому что является не только идеографическим, но и переводным, и толковым. В словаре представлено 414 украинских и 339 русских ФЕ, объединенных в 13 тематических разрядов. Словарь содержит характеристику как тематического разряда вообще, так и каждой ФЕ с толкованием и иллюстративным материалом, который отражает ее функционирование в украинском и русском языках. При написании словаря широко учитывались достижения современной психологической науки в области эмоций человека.

Фразеология украинского языка представляет большие трудности как для специалистов, так и обучающихся. Это единицы, которые складываются в недрах национальной культуры, поэтому, кроме лингвистических трудностей, представляют и трудности восприятия национально-исторического характера. О значении этих единиц почти невозможно догадаться, их нужно только знать и понимать. При переводе фразеологических единиц с национально культурным компонентом важно сохранить смысловую, коннотативную (оценочную, эмоциональную, экспрессивную, стилистическую) и функциональную информацию оригинала. Они образуют фразеологическую картину мира – часть языковой картины мира, специфичной для каждого языка. В центре фразеологической картины мира – «очеловеченная» модель мира, в которой критерием оценки является человек. Обе картины мира обращены на антропоцентрическое понимание мира.

Поэтому изучение национально-культурной специфики украинских фразеологических единиц является актуальным и важным в процессе обучения. Фразеологию любого языка необходимо изучать, чтобы устранить непонимание при межкультурной коммуникации.

Украинская фразеология прошла длительный и сложный путь развития, со своими процессами и тенденциями. Значительное количество ФЕ в украинском языке составляют национально ориентированные выражения, отразившие особенности быта, обычаев, традиций, верований украинского народа, историко-культурный компонент.

**Литература:**

1.Авксентьєв Л.Г. Сучасна українська мова: Фразеологія. Харків : Вища школа, 1983.

2. Горбачевич К.С. Про вживання терміна фразеологія // Українська мова в школі, 1962, № 3. С. 8–11.

3. Жайворонок В. В. Знаки української етнокультури. К.: Довіра, 2006.

4.Коломієць М. П. Фразеологічна синоніміка української мови. Дніпропетровськ, 1986.

5.Медведєв Ф.П. Фразеологія – багатющий скарб і невичерпне джерело народної мудрості та культури // Підсумки і проблеми наукового вивчення української мови в пожовтневий період. К., 1967.

6.Москаленко Н.А. З історії дослідження української фразеології // Українська мова і література в школі, 1967, № 10. С. 22–26.

7. Прадід Ю. Развитие фразеологической науки в Украине ((II пол. XX ст. – начало XXI ст.)//Учені записки Таврійського національного університету ім. В. І. Вернадського. Серія: Філологія. Соціальні комунікації, 2012. Т. 25 (64), № 2 (1). С. 11–42

**Ukraynada frazeologiyanın yaranması və təşəkkülü**

**Xülasə**

Ukrayna dilində frazeologizmələrin yaranması xalqın adət-ənənəsi, inancları və tarixi inkişaf yolu ilə sıx bağlı olan bir prosesdir. Elə bu səbəbdən onları müstəqil şəkildə təhlil və tədqiq etmək çox çətindir. Çünki onların komponentlərinin mənası və mənbəyinin aşkarlanması bu gün əksər hallarda artıq mümkün deyil.

Ukrayna ədəbi dilində mövcud olan frazeologizmlər ümümbəşəri mənalara söykənir və əsasən antroposentrik xarakter daşıyır. Lakin onların əsas komponenti milli çalar daşıyır.

**In Ukraine, the establishment and formation of phraseology**

**Summary**

Creation of frazeologisms in Ukrainian language is a process closely linked to the traditions, beliefs and historical development of the people. That is why it is very difficult to analyze and explore them. Because the meaning and source of their components are often unavailable today.

The frazeologisms existing in the Ukrainian literary language are commonly referred to as anthropocentric.

Key Words: frazeologisms, development, stages, culture, tradition, features

**Rəyçi: dos. Q.Ağazadə**

**Mecidova Xəyalə Mirələm qızı**
Bakı Slavyan Universiteti

# YENİ DÖVR (XXI ƏSR) TÜRK YAZIÇI VƏ ŞAİRLƏRİNİN DİL VƏ ÜSLUB XÜSUSİYYƏTLƏRİ

***Açar sözlər****: dil, üslub, yeni dövr, ədəbi yaradıcılıq, türk dili*
***Key words****: language, style, new journey, literary creativity, Turkish language*
***Ключевые слова****: язык, стиль, новая эра, литературное творчество, турецкий язык*

Yüzilliklər tarixinə malik Türkiyə türk ədəbiyyatı zəngin ənənələr zəminində inkişaf etmiş, dünya ədəbi-bədii fikrinin formalaşmasında mühüm rol oynamışdır. Lakin onu da nəzərə almaq lazımdır ki, hər bir xalqın ədəbiyyatında olduğu kimi Türkiyə türk ədəbiyyatında da özünəməxsus cəhətlər və fərqli xüsusiyyətlər diqqətdən yayınmır. Təbii olaraq burada birinci növbədə milli sənət problemlərinin qarşısında dayanan məsələlər və onun həlli yolları önəm təşkil edir. Türkiyə türk ədəbiyyatının bir özəl keyfiyyəti də ondan ibarətdir ki, bu ədəbiyyat "bir çox millətlərin ədəbiyyatları kimi bir vətəndə, son beş-altı əsr içində yox, türklərin dəyişik vətənlərində yüzillər boyu formalaşıb inkişaf etmişdir. Doğrudur, bu qədər geniş coğrafi məkanda ümumtürk ədəbiyyat və sənət ənənələri təsirindən yan keçilməsə də, Türkiyə türk ədəbiyyatı milli bir ədəbiyyat olmaq keyfiyyətini mühafizə etmişdi.

Türk ədəbiyyatı 2000-ci ildən sonra yeni bir yol çəkməyə başlamışdır. Ümumiyyətlə, hekayə və roman janrlarını nəzərə alsaq, o zaman biz bu dövrə aid bir çox ümumi mövzular və bədii araşdırmaların ön plana çıxdığını görürük.

Yeni dövr (XXI əsr) ədəbiyyatında əvvəlki dövrlə müqayisədə çox fərqli ədəbi mühit formalaşdı. Bu dövrdə artıq cərəyan və qruplardan tamamilə kənar müstəqil yazıçıların olduğu bir dövr başladı. Bu dövrdə Türkiyə oxucusu ədəbi janrlar içərisində romana üstünlük verdi. Hekayə və şeir ədəbiyyat dünyasında oxunub inkişaf edirdisə, roman geniş kütlənin maraq dairəsində idi. Dövrün çox tanınan Elif Şafak, Tuna Kiremitçi, Sema Kaygusuz, Hakan Günday və s. yazıçıları şöhrət qazandılar. Orhan Pamuk, Yaşar Kemal, Hasan Ali Toptaş, Ahmet Ümit artıq ötən əsrdə sözlərini demiş, eyni zamanda ədəbi yaradıcılığa uğurla davam edən yazarlardır. Murathan Mungan, Adalet Ağaoğlu, Selim İleri, Yahsin Yücel, Leyla Erbil, Lafite Tekin gibi harika yazarlar da artıq Türk ədəbiyyatının klassikləri sayılır. 2000-ci illərdə ötən əsrin 40-cı illərindən başlayaraq on illik dövrlərlə müxtəlif nəsillərin müəyyən bir siyasi görüş ətrafında birləşmiş qruplarından fərqli olaraq, Türk yazıçıları daha müstəqildirlər. Cümhuriyyət dövrü ideoloji istiqamətlər artıq yeni dövrdə yerini ideoloji yöndə mübahisələrə, qrup və cərəyanlar xaricində fərdi ədəbiyyata verdi. İstər məhəbbət, istərsə də ailə və siyasi romanlar olsun, qəhrəmanların daxili dünyasındakı qarşıdurmaları ifadə edilən hekayə və romanlar yazılmağa başladı. Bugün Türk ədəbiyyatında İstanbulun elit həyatından bəhs edən çox sayda roman olsa da, bir alt mədəniyyəti-küçə uşaqlarını, narkotik istifadəçilərini, həyat qadınlarını da mövzu edən əsərlər çoxdur. Vecdi Çıracıoğlu və Hakan Günday bu kimi mövzuları işləyən yazıçılardır. 2000-ci illərin II yarısından başlayaraq Türkiyədə milliyətçilik dalğası yüksəlməyə başladı. Türkiyənin Avropa Birliyinə üzvlük məsələsinin uzanması, ABŞ-ın İrağı işğal etməklə göstərdiyi güc nümayişi Türkiyə cəmiyyətində təklənmə və milli kimlik duyğusunu gücləndirdi. Nəticədə milliyətçi yöndə romanlar yazılmağa başladı. Ən güclü iki roman Burak Turna və Orkun Uçarın "Metal Fırtına" ilə Türk Qurtuluş Savaşındakı qəhrəmanlıq hekayələrindən bəhs edən Turqut Özəkmanın "Şu Çılgın Türkler" oldu. Turqut Özakmanın öz ifadəsiylə desək, dünyanın ən qanuni, ən mənəvi, ən müqəddəs müharibələrindən biri olan romanın, imperializmə qarşı ilk azadlıq müharibəsi, milliləşdirmə inqilabı, zamanın gözəl bir eposu və həqiqətən, unikal bir iş olaraq, dəyərləndirir. Doğrudan da, Türk İstiqlal Muharibəsi haqqında yazılmış mükəmməl bir əsərdir. Turqut Özakman 1948-ci ildə Polatlıdan Dumlupınar'a gedən zəfər gedişində on dostu ilə bu kitab yazmağa qərar verdi. Bu yürüyüşün baş verdiyi coğrafiya, eyni zamanda, Müstəqillik Döyüşünün ən sıx qarşıdurmalarının baş verdiyi ön bölgə idi. Burada yazır ki, Yunanıstanın işğalına və qələbəsinə şahid olan insanlar ilə söhbət etməyə və Milli Mübarizə haqqında xatirələr toplaymağa başladı. Məsələn: A*NADOLU AJANSI, camilere, kahvelere her gün tek sayfalık bültenler asarak olup bitenleri halka duyurmaktaydı. O gün hiçbir bülten asılmayınca, meraklanan Ankaralı esnaf ve zanaatkarlar, dükkânlarını, küçük atölyelerini erkenden kapatıp bugünkü Ulus meydanındaki küçük Meclis binasının önünde toplandılar. Gittikçe çoğalıyor ve sessizce cepheden haber bekliyorlardı. Adana Milletvekili Zamir [Damar] Arıkoğlu, kalabalığı telaş içinde yararak Meclis'e girdi. Kütahya - Eskişehir Savaşına Hazırlık 31 KOMİSYON odaları ve koridor, kalpaklı, fesli, sarıklı milletvekilleri ile doluydu. Zamir Bey ilk rastladığına sordu: "Hâlâ bir haber yok mu?" "Yok." Antalya Milletvekili Rasih Kaplan Hoca, "Konferans sona ermemişti ki birader, ara*

*verilmişti.." diye söyleniyordu, "..bu Yunan taarruzunun anlamı neydi?" Siyah kalpaklı, avcı ceketli, iri kıyım bir genç, Manisa Milletvekili Mustafa Necati Bey, "Ne olacak.." dedi, "..bizi konferansla uyutup gafil avlamak istediler." "Ama buna diplomasi değil, sahtekârlık derler!" Konya Milletvekili Musa Kâzım Efendi, beyaz sakalını sıvazladı: "Ordumuz direnebiliyorsa, mesele yok. Batının bu oyununu da boşa çıkarırız." BU SIRADA görevden dönen çift kanatlı bir keşif uçağı, Eskişehir/ Muttalip havaalanına yaklaşmaktaydı.*.(4,12)

Beləliklə, 2001-ci ildə Türkiyədə iqtisadi böhranın aradan qalxmağa başlaması ilə çap məhsulları, kitab yayımı artdı. Hər biri 50-100 min satılan kitablar yayımlandı. Ahmet Altan, Ahmet Ümit, Orhan Pamuk, Elif Şafak, Ayşe Kulin, Murathan Mungan kimi yazarların tanınması, geniş oxucu kütləsindən gördükləri maraq, kitabların reklam kampanyalarıyla yayımlanması və bu yazarların gəlirlərinin artması gənc yazarlara da ciddi təsir göstərdi. Yazıçılıq, xüsusilə də roman yazarlığı sevimli işə çevrildi. Hər bir yazıçının özünə məxsus üslubu vardır. Bəllidir ki, üslub dedikdə yazıçının, onun dünyagörüşü, təsvir etdiyi hadisələr və xarakterlər dairəsi, onun yaratdığı bədii təsvir və ifadə vasitələri vəs. nəzərdə tutulur. Özünəməxsus üslubu olmayan yazıçılar ədəbiyyata heç bir yenilik gətirə bilmir və tezliklə də yaddan çıxır, unudulur. Yazıçı dramaturq Orhan Pamuk belə sənətkarlardan biridir. Onun özünə xas son dərəcə özəl bir üslubu vardır. əlbəttə, O.Pamukun bir nasir, dramaturq kimi parlamasında ustadlarından aldığı mənəvi qidanın xüsusi rolu olmuşdur. Onun yeni, həm də kəskin söz demək üçün yazıçı cəsarətinin, mənəvi qəhrəmanlığın lazım olduğunu yetərincə dərk edən sənətkarlardandır. Dünya şöhrətli türk yazıçısı, Nobel mükafatı laureatı Orhan Pamukun "Qar" və "Mənim adım qırmızı" romanlarından sonra "Yeni həyat" romanı da Azərbaycan türkcəsinə çevrilib. Orhan Pamukun maraqlı əsərlərindən biri olan "Yeni Həyat" insanlara qəzanın, ölümün, səyahətlərin sirlərini açıqlayır.

*"Bir gün bir kitab oxudum və bütün həyatım dəyişdi" - "Yeni həyat" bu sözlərlə başlayır. Əsərin qəhrəmanı kitabın təsiri ilə aşiq olur, tələbəlik həyatından uzaqlaşır, İstanbulu tərk edir, davamlı avtobusla səyahətə çıxır, şəhərlərə, qəsəbələrə gedir. Özünü və zamanını azdırır. Başqa dünyaya - Yeni Həyata daxil olur. Roman həm əvəzsiz Zamanın, Ölümün, Taleyin, Yazının, Qəzanın sirlərinə, həm də uşaq vaxtı oxunan şəkilli romanlarına, Dantenin, Rilkenin şeirlərinə açılan qapıdır. Roman oxuduğu kitabdan təsirlənən, oxuduğu səhifələrdən həyatına yeni işıq düşən və kitabın vəd elədiyi həyatın arxasınca gedən bir qəhrəmanın taleyindən bəhsedir.* (5, 178)

2000-ci illərin ortalarından etibarən ən çox oxunan günlük siyasi hadisələrdən, məhəbbətdən, psixoloji mövzulu, milli duyğularla səsləşən nəzəriyyələr, qəhrəmanlıq hekayələri haqqında yazılmış əsərlərdir. 2000-ci illərin ən diqqət çəkən yazarlarından biri Tuna Kiremtiçidir. O, 2002 və 2003-cü illərdə çap olunan iki roman ilə fenomenə çevrildi. "Git kendini çok sevdirmeden" romanı qısa müddətdə ən çox satılanlar siyahısına girdi. Oxucu onun məhəbbət və tənhalıqdan yazdığı sadə, ancaq təsirli cümlələrini çox sevmişdi. Tuna Kiremitçi 2003-cü ildə çıxan "Bu işte bir yalnızlık var" romanında insan sevgisinin əskikliyinin yaratdığı problemləri, məhəbbətin sərhədini və qaçılmaz sonluqlarını ustalıqla qələmə alıb. Kiremitçi ilk "Git kendini çok sevdirmeden" romanında qəhrəmanı Ardanın həm coşğulu və macəra dolu gənclik illərini, həm də hər şeyini itirmiş, həyat ilə intiharın bir addımlığında olan, lakin yenidən həyata bağlanmağın yollarını tapdığı 40-lı yaşlarını ustalıqla və əlaqəli şəkildə verə bilmişdir. Bu çox uğurlu romanların ardından Tuna Kiremitçi **"**Yolda üç kişi" də üç fərqli nəsildən və xarakterdən insanın yollarını sevgidə kəsiştirən bənzər bir romanla yoluna davam etdi. Daha sonra çıxan "AŞK neyin kısaltması" və "Dualar kalıcıdır" kitapları ilk kitabları qədər maraq yaratmasa da, Tuna Kiremitçi hələ də Türkiyənin ən populyar yazarlarından biridir.

Hakan Günday. 2000-ci ildə 24 yaşında "Kinyas və Kayra" adlı ilk romanı çap olunan Hakan Günday oxucusu olan böyük gənc nəsli təsiri altına aldı. "Kinyas və Kayra"dakı nihilism (insan mövcudluğunun dərk olunmasının, ümumi qəbul edilmiş əxlaqi və mədəni dəyərlərin inkarında özünü büruzə verən dünyagörüşü, avtoritetlərin qəbul edilməməsi), laqeydlik, qanunsuzluq, şiddet və macərapərəstlik bu dövrün gəncliyində inanılmaz qarşılıq tapdı. Məsələn: *"Hiç uykum yok. Hiç uyuyamıyorum. Domuz gibi içiyorum. Ama gözlerimi kapalı bile tutamıyorum. Sabaha beş saat var. Annemi düşünüyorum. Nerededir şimdi? Aynada kendime bakıyorum bazen. Ve tek kelime etmesem bile vücudum yaşadıklarımı, hayattan ne anladığımı anlatmaya yetiyor. Sağ omzuma kendi çizdiğim kelebek, eğenmediğim için üzerine attığım çarpı işareti ve altında aynı kelebeğin bir Japon tarafından çok daha iyi işlenmişi. Sol dirseğimin iki parmak yukarısındaki kurşun yarası.Bileklerimdeki otuz dört dikiş. Medeniyeti bir aralar, herkes gibi yaladığımı kanıtlayan apandist ameliyatımın izi. Ve sırtımı kaplayan Tanrı'nın yüzü. Bilmiyorum... Hızlı yaşadım. Ama genç ölmekten çok, hızlı yaşlandım! Ancak hayattayım*. (2, 65)

Elif Şafak 2000-ci illərdə Türk ədəbiyyatının ən sevilən yazıçılarındandır. Türkiyədə çox oxunan və ədəbiyyat çevrələrində də diqqətə alınan bu yazar ölkədən kənarda da böyük maraq gördü. Elif Şafa Halide Edip Adıvardan bu yana çok oxunan romanlarının bəzilərini ingiliscə yazan ilk Türk kadın yazarıdır. Aslında Elif Şafak 1990-cı illərin sonu tanınmağa başladı. 1998-ci ildə yazdığı ilk romanı "Pinhan" idi. Uşaqlıq və

gəncliyini xaricdə keçirmiş Elif Şafak Türkiyə tarixinə, dilinə və inanclarına böyük maraq göstərir və bunu əsərlərində də qələmə alırdı. "Şehrin Aynaları" və 2000-ci ildə çıxan "Mahrem" romanı da bu xüsusiyyətləri ilə seçilirdi. "Mahrem" Elif Şafakın ən gözəl romanlarından biri olaraq ədəbiyyat dünyasındakı yerini saxlamaqdadır. "Baba ve Piç" əsəri ortalığı bir-birinə qatdı. Türk-erməni məsələsi və erməni soyqırımından bəhs edən əsər Türkiyədə ciddi narazılığa səbəb oldu və yazıçıya Cəza Qanununun 301-ci maddəsi ilə cəza istənildi. Lakin ABŞ və Avropada da geniş oxucu kütləsi olan E.Şafak ciddi etirazlar səbəbi ilə bəraət aldı. Kitab 2006-cı ilin ən çox oxunan romanlarından biri oldu. Bəllidir ki, həqiqi yazıçının bədii arsenalı məhdud çərçivəyə sığa bilmir. Cünki, məhdud çərçivəni əhatə edən əsərlər yazılırsa, sənətdə süstlük, mənəvi boşluq yaranır. Yazıçı E.Şafak həmişə müasir, həyatla bağlı olan, mənəvi dəyərini itirməyən əsərlərin müəllifidir. Məsələn: *Ama elbet bir sebebi vardı: Aşk! Âşık oldu Ella hiç beklenmedik bir biçimde, beklemediği bir adama. İkisi ne aynı şehirde yaşıyordu ne de aynı kıtada. Aralarındaki fersah fersah uzaklık bir kenara, kişilikleri en az gündüz ile gece kadar farklıydı. Yaşam tarzları ise alabildiğine başkaydı. Arada tam bir uçurum vardı. Normal şartlar altında birbirlerine tahammül etmeleri bile zor iken, aşk odu'nda yanmaları beklenmedik bir hadiseydi. Ama oldu işte. Hem de öyle çabuk oldu ki, Ella başına ne geldiğini anlayıp, kendini koruyamadı bile. Tabii şayet insanın kendini aşktan koruması mümkünse!* (7, 14)

Murat Uyurkulakın 2002-ci ildə çıxan ilk romanı "Tol" həm poetik anlatımı, həm də siyasi görüşləri ilə oxucuları heyran edə bildi. Jurnalist olan Murat Uyurkulak uzun illər üzərində işlədiyi bu romanda İstanbuldan Diyarbakıra olan Qatar yolculuğunu anlatır. Əsərdə gənc bir redaktorun və yaşlı bir şairin yolboyu söhbətlərində Türkiyənin yaxın keçmişi gözdən keçirilir. Yazıçı əsərdə cinayət, işgəncə və hər cür qəddarlıq nəticəsində ruhu yaralanmış insanlardan bəhs edir. 2006-cı ildə çıxan "Har" romanı yerdəkilər və göydəkilər arasında baş verən bir hadisədə Türkiyə həyatından bəhs edən fantastik romandır. Məhz bu romanı yazıçının sonrakı əsərləri üçün zəmin yaradır. Bəzən bir cümlə ilə xarakter yaratmaq, kiçik bir abzasla güclü emosional təsir oyatmaq olur. Yeni güclü bənzətmələr, metaforalar, üslub və kompozisiya elementlərinə geniş yer vermək bacarığı bu romandan başlayır digər əsərlərə ötürülərək daha da gücləndirilir.

Oya Baydar 1980-ci il çevrilişi ilə Almanyaya qaçmaq məcburiyyətində qalmış bir isimdir. O, ədəbiyyata Berlin divarlarının yıxılmasına həsr etdiyi "Elveda Alyoşa" əsəri ilə gəldi. Siyasi roman yazarı olan O.Baydar digərlərindən fərqli olaraq həm varlı insanları, həm intellektual, həm də yoxsul təbəqənin yaşamlarındakı kəsişmə nöqtələrini uyğun bir dilli işləyə bilmişdir. Bunlar zamanı insanlar üzərində yaratdığı ağırlığı anlata bilən psixoloji romanlardır. Yaxın mövzularda yazılan "Sıcak külleri qaldı" və "Erguvan Kapısı"ndan sonra, yaxın zamanlarda çap etdirdiyi "Kayıp Söz" də çox bəyənildi.

1990-cı illərdə hekayə yazarı kimi tanınan Sema Kaygusuz 2000-ci illərdə öncə "Sandık lekesi" adlı öykü kitabı, daha sonra çox bəyənilən "Yere düşen dualar" adlı ilk romanıyla tanındı. Öykülərində ənənəvi Anadolu hekayələrini, əfsanələrini, masalları xatırladan bir dildən istifadə edən Sema Kaygusuz ilk romanında da biraz masalçı atmosfer yaartmışdı. Hamdi Koçun "Melekler erkek olur" kitabı 2002-ci ilin ən çox oxunan romanı oldu. Hamdi Koç qırx yaşında həyat yoldaşından ayrılaraq başqa münasibətlər yaşayan tipik tipik şəhərli xarakerliylə modern romanın da tipik nümunəsini yaratmışdı. Yenə aşk mövzusunda olan "Çiçeklerin Tanrısı" romanı 2003-cü ildə çap olundu.

Bəhs olunan yazıçılar müasir Türk ədəbiyyatında 2000-ci illərin çox oxunan, daha çox özündən söz etdirən ədəbi fəaliyyələri ilə də fərqlənən yazıçılardır. Onların yaradıcılığında ortaq mövzu və üslublardan danışmaq olmaz, sadəcə ədəbi yanaşmada fərdilik ortaq nöqtələr olduqca çoxdur. Türk dilinə xas olan ən ümdə keyfiyyətləri hekayə, povest və romanlarda görmək olur. Sözün həqiqi mənasında, linqvistik materiallar həddən artıq çoxdur və bu "materiallar" cəmiyyətə çatdırılıb. Yazıçıların nəsr dili və üslubunun spesifikliyini əlbəttə, həmin "materiallar" daha yaxşı üzə çıxara bilir. Bilindiyi kimi, əsərin gözəlliyi də hər bir yazıçının dilindən, üslubundan, ifadə manerasından hiss edilir və duyulur.

**Ədəbiyyat:**

1. Bardar O. Erguvan kapıları, İstanbul, Can Yayını, 2010
2. Gunday H. Knyas ve Kayra, İstanbul, Doğan Yayınevi, 2000
3. Kaygusuz S. Sandık lekesi, İstanbul, Metis Yayınevi, 2015
4. Özakman T. Şu Çılgın Türkler,İstanbul, Bilgi Yayinevi, 2005
5. Pamuk O. Yeni hayat, İstanbul, İletişim Yayınları, 2001
6. Türk Romanı Özel Sayısı (2 Cilt), İstanbul, Hece Yayınevi, 2002
7. Şafak E. Aşk, İstanbul, Doğan KitapY.E., 2009

**Language and styles of Turkish writers and poets in the new era (XXI century)**

**Summary**

Turkish literature has started a new journey, since 2000. In the XXI century, a very different literary environment was formed compared to the previous period in Turkish literature. In this period, there are now independent writers who are already in the process and are completely out of groups. In this period, the Turkish reader preferred the novel in literary genres. Although the story and poetry were read and developed in the world of literature, the novel was in the vast interest of the audience.

**Язык и стили турецких писателей и поэтов в новой эпохи (XXI век)**

**Резюме**

С 2000-го года турецкая литература встает на новый путь своего развития. В сравнении с ранним периодом в 21 веке начинается формирование новой литературной среды. Этот период знаменуется появлением независимых писателей, которые были полностью далеки от разных течений и групп. На этом этапе развития турецкой литературы, турецкий читатель, среди прочих жанров, отдает предпочтение роману. Несмотря на то, что повесть и поэзия продолжают развиваться, все же роман остается в центре внимания широких масс.

**Rəyçi: dos. V.Ç.Həsənova**

**Ağayeva Natəvan Fəxrəddin qızı**
Azərbaycan Dövlət İqtisad Universiteti

# TARİXİ GERÇƏKLİYİN AÇILMASINDA TOPONİMLƏR VƏ ETNOTOPONİMLƏR ƏVƏZEDİLMƏZ MƏNBƏDİR

***Açar söz:*** *toponim, etnotoponim, onomastik, areal, xəzinə, etnogen*
***Key words:*** *toponim, etnotoponim, onomastic, local, treasure, etnogenic*
***Ключевые слова:*** *топоним, этнотопоним, ономастический, ареал, этноген*

Bu dəhşətli hadisələr bəşəriyyətə qarşı cinayət kimi hüquqi – siyasi qiymətini almalıdır. Dünya dövlətləri bu pirinsipial məsələdə mövqelərini yenidən dəqiqləşdirməli, erməni təbliğatı nəticəsində formalaşmış stereotiplərdən imtina etməlidilər.

Bu, bir tərəfdən həmin hadisənin bir daha təkrarlanmasına yol verməmək üçün vacibdir, o biri tərəfdən isə, soyqırımı qurbanlarının xatirəsi qarşısında bizim vətəndaşlıq borcumuzdu.

**Ümummilli Liderimiz Heydər Əliyev**

Azərbaycanlılar dünyanın ən qədim xalqlarından biri, Şumer mədəniyyətinin varisidir. Cənnət kimi gözəl Azərbaycan torpaqlarında tarix boyu yadellilərin gözü olub. Dünyanın ən böyük cahangirləri dəfələrlə Azərbaycana qoşun çəkmiş, bu torpağın hər qarışı insan qanı ilə yoğrulmuşdur. Tarixin müəyyən dönəmlərində Vətənimiz işğala məruz qalmış, torpaqlarımız hissə - hissə bölüşdürülmüşdür. Dəmirqapı Dərbəndi, Borçalını, Təbrizi, Zəngəzuru, Göyçəni, Zəngibasarı, Dərələyəzi Azərbaycanımızdan qoparmışlar.

Tarixi gerçəkliyin acılmasında toponimlər və etnotoponimlər əvəzedilməz mənbədir. Azərbaycan xalqının qədim və zəngin tarixi ilə yaşıd olan toponimlər, etnotoponilmər daş kitabələr, abidələr kimi tarixin özünə şahidlik edir.

**Allar** - Zəngəzur ərazisində Gorus rayonunda kənd adıdı. Bir çox mənbələrdə kəndin adı Alarlar kimi verilib. Bazarçayın sol sahilində, meşəlik ərazidə yerləşirdi. Alarlar moğol türklərinin oyrat qoluna mənsub olan tayfadır. XIII əsirdə moğol yürüşləri zamanı Qafqaza gəlmiş, şahsevənlərin tayfa birliyinə daxil olmuş və müxtəlif regionlarda məskunlaşmışlar. Azərbaycanın Yardımlı və Cəlilabad rayonlarında, Türkiyənin Sivas bölgəsindən və Cənubi Azərbaycanda da Allar kəndləri vardır. Andronikin Zəngəzura hücumu zamanı 1918 – ci ildə azərbaycanlı əhalisi qovulmuş və kənd dağıdılmışdır.

**Ağaflı** - Zəngəzur ərazisində Gorus rayonunda kənd adıdı. 1913 – cü ildə D.D.Paqirevin tərtib etdiyi "Qafqazın beş verstlik xəritəsinin ad göstəricisi" toplusunda kəndin adı Aqaplu şəklində göstərilmişdir. Gorus rayon mərkəzindən 23 km. şimal - şərqdə yerləşmişdi. Kənd XX əsrin əvvəllərində dağıdılmışdır. Kəndin adı kəndin əsasını qoyan Ağaflı nəslinin adı ilə bağlıdır.

**Alaçadırlı Məzməzək** - Zəngəzur ərazisində Qarakilsə rayonunda kənd adıdı. Bırlılar əzi mənbələrdə bu kənd adı oba adı kimi qeyd olunur, bəzilərində Məzməzək nəslinin yaylaq yeri kimi qeyd olunur. Toponim əslində Məzməzək kəndində olan Alacadirli adlanan tayfanın adı ilə bağlıdır. Bu tayfa əsasən maldarlıqla məşğul olub, yayı Qarakilsənin dağlarında, qışı Bərdədə alaçadırlı nəslinin oturaq həyat keçirdiyi Alaçadırlı kəndində məskən salmışdılar. Kəndin adı etnotoponimdir, alaçadırlılar nəslinin adından yaranıb.

**Alıqulu** - Zəngəzur ərazisində Laçın rayonunda kənd adıdı. Kənd Pircahan kənd inzibati ərazi vahidliyinin tabeliyindədir, rayon mərkəzindən şimal – qərbdə, rayonun 36 km – də, dəniz səviyyəsindən təxminən 1500 – 1600 m hündürlükdə yerləşir. Kəndin ərazisi 824 hektardır. Kəndin yaxınlığından Laçın – Kəlbəcər, Laçın – Şəlvə - Qorçu şose yolları keçir. Suludərə, Qabaqtəpə dağı, Qızdırma bulağı, Daş bulaq və s. Mikrotoponimlər vardır. Alıqulu kəndi Pircahan, Aşağı Qaracanlı, Yuxarı Qaracanlı, Bülövlük kəndləri ilə qonşudur. Kənddə işğala qədər (1992) orta məktəb, mədəniyyət evi, kitabxana, tibb məntəqəsi, mağaza, televizor ötürücü stansiyası, ATS və digər sosial obiyektlər var idi. 86 ev, 407 nəfər əhali olmuşdu. Yerli sakinlərin verdiyi məlumata görə, Alı uşağı nəslindən olan Alıqulu adlı bəyin torpaqları olduğundan kəndə Alıqulu adını vermişlər. Kənddə tapılan küp qəbirlər kəndin çox qədim olduğunu sübut edir.

**Arıqlı** (Ərikli) - Zəngəzur ərazisində Laçın rayonunda kənd adıdı. Çox güman ki, bölgədəki çoxsaylı Arıqlı, Ərikli toponimləri ilə eyni mənalıdır. Kəndin adı Ağqoyunlu tayfa birliyinə daxil olan arıqlı türk tayfasının adını özündə ehtiva edir. 1924 – cü ildə 70 nəfər yaşadığı bildirilir. Kollektivləşmə ilə əlaqədar olaraq kənd dağılmışdı.

**Bayandur** - Gorus rayonunda kənd adıdı. Kənd rayon ərazisinin 37 km yerləşir. Kəndin adı erməni mənbələrinə istinadən I Bayandur, II Bayandur adı kimi qeyd olunur. Bayandur çayının 5 km yerləşir, tarixi çoxdur, kəndin əhalisi əsasən azərbaycanlılar olub. 1916 – cı ildə kənd erməni təcavüzünə məruz qalb, azərbaycanlıları kəndən çıxardıblar. 1918-ci ilə dək tədricən erməniləri kəndə gətirib kəndi erməni kəndi ediblər. 1969-cu ildən kəndin adı dəyişdirilib Vağatur qoyulub. Toponim qədim bayandur tayfasının adından yaranan etnotoponimdir.

**Baharlı** - Qafan rayonunda kənd adıdı. Rayon mərkəzindən 24 km şimal şərqdə Kığı çayının sol sahilində yerləşir.

Kəndində tarix boyu azərbaycanlılar yaşadıqları halda 1948-ci ildə kəndin sakinlərini qonşu Kığı kəndinə köçürüb yerində mis zavodu üçün su anbarı tikmişlər. Baharlı adlı rayon ərazidə daha bir kənd adı var, kənd Basut çayının sağ sahilində yerləşir. Toponim baharlı türk tayfasının adından yaranan etnotoponimdir.

**Canbar** - Zəngilan rayonunda kənd. Dağətəyi ərazidədir. Canbar kənd inzibati ərazi dairəsinin mərkəzidir. Kənd rayon mərkəzindən qərbdə, rayonun 33 km – də, dəniz səviyyəsindən 1200 m hündürlükdə yerləşir. Mincivan – Qafan dəmiryolunun Bürünlü dayanacağından 11 km məsafədədir. Kəndin qarşı tərəfindəki biçənəklikdə qədim Alban kilsəsi var idi.

İnqilaba qədərki ədəbiyyatda toponimin Cambar formasına rast gəlinir. Yaşayış məntəqəsinin dərzili tayfasının azadlı, ələsgərli və güllü tirələrinə mənsub ailələr Canbar adlı ərazidə saldığı üçün belə adlandırılmışdır.

**Cıbıllı** - Qafan rayonunda kənd. Rayon mərkəzindən 6 – 7 km cənub – şərqdə yerləşir. Toponimin mənası XV əsrdə bu ərazidə məskunlaşan cibikli türk tayfasının adı ilə bağlıdır. 1920 – ci illərin axırlarında kənd dağıdılmış, əhalisi qonşu azərbaycanlı kəndlərinə köçürülmüşdür.

**Comərdli** - Qarakilsə rayonunda kənd. Rayonun azərbaycanlılar yaşayan dağ kəndidir. Rayon mərkəzindən 18 km qərbdə dəniz səviyyəsindən 2500 metr yüksəklikdə, Təzəkənd kəndindən 6 km, Ərəfsə kəndindən 3 km məsafədə yerləşir. Comərdli kəndi təmiz havası, saf, diş göynədən bulaqları, gözəl Alp cəmənliyi olan yaraşıqlı dağ kəndidir. Kəndin bulaqları toplaşaraq Xırda çay adlanan, kəndə xüsusi yaraşıq verən dağ çayını əmələ gətirirdi ki, həmin çay Ərəfsə kəndindən keçən Dəli çaya qovuşur və Qarakilsə rayon mərkəzi yaxınlığında Bazar çaya tökülürdü. Yerli sakinlər kəndin adını "Comartlı" şəklində tələffüz edirdilər. Mənşəcə kəngərlilərin sofulu tayfasına mənsub ailələrin məskunlaşması nəticəsində yaranmışdır. Comərdli sözü kəndin binasını qoymuş Comərd kişinin adı ilə bağlıdır.

Bu kəndi iki qardaş - Kərbəlayı Comərd və Alagöz Məhəmməd salmışlar. Kənddə yaşayanların hamısı bu iki qardaşın törəməsidir.

**Dəmirçilər** - Qubadlı rayonunda kənd adı. Dağətəyi ərazidədir. Dəmirçilər kənd inzibati ərazi vahidinin mərkəzidir. Ərazisindən Bərgüşad və Ağa çayları axır. Kəndin adı Qızılbaşların Dəmirçilər tayfasının adı ilə əlaqədardır.

**Dəymədağlı** - Qafan rayonunda kənd adı. Kəndin adı Qarabağ ellərindən biri olan Kolanlı türklərinin Dəymədağlı qolunun məskunlaşması nəticəsində yaranmışdır. Cavad, Nuxa və Şamaxı qəzalarında Dəymədağlı kəndlərinin adları ilə mənşəcə eynidir.

**Dəymədağlı** - Zəngəzurda dağ adı. Toponimin mənası eyni adlı tayfanın bu dağın ətəyində məskunlaşması ilə əlaqədardır.

**Dondarlı** - Qubadlı rayonunda kənd adı. Bərgüşad çayının sağ sahilində, Bərgüşad silsiləsində, Hərtiz dağının ətəyində yerləşir. Dondarlı kənd inzibati ərazi dairəsinin mərkəzidir. Ərazisindən Qubadlı – Akara şose yolu keçir. Dondarlı kəndi Qubadlı qəsəbəsi, Dəmirçilər, Fərcan və Çərəli kəndləri ilə qonşudur. Kənddə Ağdərə adlanan yerdə yüz illərlə yaşı olan "Yel Piri" adlanan nadir Saqqız ağacı var idi. Toponim qədim türkdilli Dondar tayfasının adı ilə əlaqədardır. Antik mənbələrə görə, dondarlı e.ə. V əsirdən məlumdur. Azərbaycanda orta əsirlərdə dondar etnonimindən törənən toponimlər çoxdur. "Kitabi – Dədə - Qorqud" dasdanının qəhrəmanlarından birinin adı Dəli Dondardır.

Qaraçılar kimi yer - yurdu bilinməyən və zaman – zaman xarici ölkələrdən qovularaq Azərbaycanın cənnət guşələrinə pənah gətirən düşmənimiz ermənilər bu kitabələri, abidələri oğurluyaraq özününküləşdirməyə çalışıblar. Lakin özününkü olmayan heç nə səninki ola bilməz. İşğal olunmuş torpaqlarımızın hər daşının, hər qayasının, hər kəndinin, hər şəhərinin tarixini tədqiq etdikdə məlum olur ki, onların hər biri türk – Azərbaycan mənşəlidir. Ermənilər isə həyəsizlıqla özlərinə saxta tarix "yaradırlar". Arxeoloji qazıntılar aparıb türk mənşəli abidələri, qəbirləri erməniləşdirib öz adlarına çıxırlar. Bəşəriyyət belə hallara qarşı nə qədər soyuqqanlı olsa da, tarix bunu heç vaxt unutmayacaq. Dünən açıla bilməyən, bu gün açılmayan tarix, nəhayət, vaxtı gələndə açılacaq. Hər şey öz yerini tutacaq. Nahaqdan deməyiblər ki, tarix təkrar olunur. Bəli, tarix təkrarlanacaq, haqq öz yerini alacaq, nahaq qan yerdə qalmayacaq, ulularımızın narahat ruhu rahatlıq tapacaq.

Təkcə son yüzillik tarixi dövrü vərəqləyərək, Azərbaycan xalqının başına nə kimi faciələrin gəldiyini görürük . İşğal, genosid, soyqırım daha nələr. Dinc əhali kütləvi surətdə qətilə yetirilib, kəndlər dağıdılıb,

yerlə - yeksan olunub. Dünyanın ən qədim torpağı olan Azərbaycan, ən qədim millətlərindən biri olan azərbaycanlılar əsirlərlə soyqırımı siyasətinə məruz qalıblar. Azərbaycan öz müstəqilliyini 1991 – ci il oktyabrın 18 – də bərpa etdi. Xalqımızın tarixində yeni bir dövrün başlanğıcını qoymuş bu böyük hadisə Vətənimizin namərd ermənilər tərəfindən ərazi iddiasına məruz qaldığı bir vaxtda düşdü. Nankor qonşularımız əsirlərdən bəri türk – oğuz elinə aid olan Qərbi Azərbaycan torpaqlarına sahib çıxdılar. "Bu ərazi bizimdi" – deyərək, dəfələrlə soydaşlarımızı öz doğma torpaqlarında qovub özlərinə yurd etdilər. Öz namərd xislətləri ilə hər yerdən üzüqaralıqla qovulan ermənilər sonradan rusların köməyi ilə qədim türk – oğuz torpağına qətirilib məskunlaşdırılıblar. Orada sığınacaq tapıb, özlərinə yer edəndən sonra onlar yerli türk əhalisini öz dədə - baba torpaqlarından sıxışdırılıb çıxararaq "böyük Ermənistan" yaratmaq fikrinə düşdülər. Azərbaycanlılar bir əsirdə neçə dəfə işğala, genosidə məruz qalıb. 1905-1907-ci illər, 1918-1920-ci illər, 1948-1953-cü illər, 1988-1993-cü illər. Əsirlərdən bəri apardıqları, "türksüz Ermənistan" siyasətinə daşnaqlar əslində nail olublar. Görünməmiş faciələr, dəşətli hadisələrlə yaddaşımıza həkk olunub bu tarix. İndi hər bir azərbaycanlının ən ümdə vəzifəsi tariximizi dərindən öyrənib gələcək nəsillərə çatdırmaqdır. Möhtərəm Prezidentimiz, dünya şöhrətli dövlət xadimi, ümummilli liderimiz Heydər Əliyev xalqımıza qarşı zaman – zaman aparılan terroru, haqsızlığı, deportasıyanı, soyqırımı nəzərə alaraq 31 martı azərbaycanlıların soyqırım günü elan etmişdi.

Biz əminik ki, ümummilli liderimizin siyasi xəttini uğurla davam etdirən cənab İlham Əliyevin rəhbərliyi altında tezliklə torpaqlarımızı geri qaytaracağı və bir daha Azərbaycan xalqına qarşı soyqrımı siyasəti aparmağa heç vaxt, heç bir dövlət cürət etməyəcək. Bu gün hər bir azərbaycanlı Prezident İlham Əliyevin ətrafında sıx birləşərək onun apardığı siyasətin təntənəsinə yardımçı olmalıdır. Bunu ümumxalq, ümumdövlət mənafeyimiz tələb edi.

**Ədəbiyyat:**

1. Bayramov İ. Qərbi Azərbaycan türk mənşəli toponimləri. Bakı "Elm" 2002.346 səh
2. Musa Urud. Zəngəzurun etnotoponimləri. (Elmi - publistik nəşr) Bakı,2012 .361 səh.
3. Rüstəmov Ə.M. Ermənistan SSR Qafan, Gorus və Sisyan rayonları ərazisinin Azərbaycan mənşəli toponimləri (nam.dis.). Bakı, 1990, 158 səh
4. Həsən Mirzəyev. Dərələyəz mahalının toponimləri və şivə sözləri. Bakı. "Ağrıdağ" nəşriyyatı. 2003, 360 səh.

**Toponyms and ethnotoponyms in the discovery of historical reality an indispensable source**

**Summary**

Historical facts show that separate regions and dialects and zones belonging to these regions are an inexhaustible treasure for onomastic units. The names given to the clan, tribe, dynasty, people, place, monument, etc., are kept and preserved from history to generation and generations. Ethnotoponism is one of the constituents of onomastic units. The term ethnotophone is derived from ethnos Greek origin (folk and anonymus), and the tribe, tribe, people are called ethnotophone. Ethnotoponyms are real language facts that keep the traces of our past. Looking at the ethnic composition, origins, etnogenesis of each nation, its particular significance of ethnotoponyms, especially the history of Turkish ethnotopones, is very ancient.

**Топонимы и этнотопонимы являются незаменимыми источниками в раскрытии исторической правды**

**Резюме**

Исторические факты показывают, что отдельные регионы, диалекты и зоны, принадлежащие этим регионам, являются неисчерпаемым сокровищем для ономастических единиц. Имена, данные клану, племени, династии, людям, месту, памятнику и т. д. сохраняются от истории к поколению и поколениям. Этнотонизм является одной из составляющих ономастических единиц. Термин этнотофон происходит от этноса греческого происхождения (фолк и анонимус), а племя, племя, люди называются этнотофонами. Этнотопонимы - это реальные языковые факты, которые хранят следы нашего прошлого. Глядя на этнический состав, происхождение, этногенез каждой нации, ее особую значимость этнотопонимы, особенно историю турецких этнотопонов, очень древний.

**Rəyçilər: prof. Buludxan Xəlilov,**
**prof. Mahirə Hüseynova**

**Məmmədova Aynurə İdris qızı**
Bakı İdarəetmə və Texnologiya Kolleci

## BƏDİİ VƏ PUBLİSİST ÜSLUBLARIN QARŞILIQLI ƏLAQƏSİ

***Açar sözlər***: *bədii üslub, publisist üslub, üslublar, ədəbi dil, üslub xüsusiyyətləri*
***Key words:*** *the belles-lettres style, the publicist style, the styles, the literary language, the identity of the style*
***Ключевые слова***: *художественный стиль, публицистический стиль, стили, литературный язык, особенности стилей*

Ədəbi dil əslində üslublar sistemidir. Cəmiyyət inkişaf etdikcə dilin fəaliyyət dairələri genişlənir. Nəticədə funksional ixtisaslaşma meydana çıxır və bir qrup leksik, morfoloji, sintaktik vahidlər sanki bir sahəyə təhkim olunur, orada fəaliyyət göstərərək konkret üslubi çalar alır. Bir üsluba xas olan bəzi ifadə vasitələri başqa üslubda işlənərək yeni vəzifə daşıya bilir.

Dilçilik ədəbiyyatında funksional üslubların növləri və onlar arasındakı qarşılıqlı əlaqələrin olduğu qeyd olunmuşdur. Bu qeydlərə əsaslanaraq tədqiqatçı A.Quliyeva üslubların əlaqəsinə aid tədqiqat işlərinin iki istiqamətdə aparıldığını göstərmişdir: "1) bir üslubun digər üslub ilə qarşılıqlı əlaqəsi; 2) bir üsluba məxsus müəyyən elementin və ya elementlərin digər üslubda təzahürü" (1, s. 6). Bu cür əlaqələrin aşkarlanması və tədqiqata cəlb olunması dildə gedən prosesləri izləmək mənasında çox vacibdir. Çünki onlar sözlərdə semantik yeniliyin əmələ gəlməsinə, dilin funksional rəngarəngliyini artırılmasına təkan verən proseslərdir.

Funksional üslubların hər birinin özünəməxsusluğu olsa da, onların arasında tam və qəti sərhəd qoymaq mümkün deyildir. Çünki bütövlükdə bu üslublar ədəbi dilin bazasını təşkil edir. Bu üslubları birləşdirən başlıca cəhət dil normalılığından onların bərabərhüquqlu istifadə etməsindən ibarətdir. Ümumiyyətlə, ədəbi dilin funksional üslublarının hər biri üçün nitq səslərindən vergüllərə qədər hər bir dil vahidinin ümumi ədəbi dil normasıına uyğun işlədilməsi, sərbəstliyə yol verilməməsi, dil vahidlərinin ixtiyari şəkildə istifadə olunmaması başlıca və mühüm tələbdir". Üslublar arasındakı fərqlər dilin səviyyələrində müxtəlif şəkildə əks olunur; başqa sözlə desək, hər bir üslub dil vasitələrinin işlənməsinə görə bir-birindən fərqlənir. Funksional üslubların diferensiallaşması ədəbi dilin inkişaf tarixinin müəyyən dövrlərində baş verən davamlı bir prosesdir və bu üslublara aid ən mühüm əlamətlərin daha qabarıq şəkildə təzahür etməsi ilə bağlıdır.

V.V. Vinoqradov üslubların diferensiallaşmasının səbəbini dil və kəmiyyətin əlaqəli inkişafı ilə izah edir. O, qeyd edir ki, ümummilli dilin üslubu bütün sahələrini – onun səs quruluşunu, qrammatikasını, lüğət və frazeologiyasını əhatə edir. Üslub bir tərəfdən, tarixi inkişafla əlaqədar uyğun hadisələrin (paralel, sinonim, oxşar ifadə vasitələrinin, ayrı-ayrı vahidlərin) əlaqə və qarşılıqlı təsiri, digər tərəfdən isə, bu dil hadisələrinin nitq prasesində müxtəlif formalarla, yaxud ictimai şəraitdən asılı olaraq nitqin müxtəlif şəkildə təzahüründən ibarətdir.

Hər bir üslubun mühüm əlamətləri olduğu kimi, bədii və publisist üslublarda özünəməxsus fərqləndirici əlamətlərə malikdir. İstər bədii, istərsə də publisist üslubun xarakterik cəhətlərini, onların qarşılıqlı əlaqəsini öyrənmək üçün, bilavasitə, hər bir üsluba məxsus ekstralinqvistik amillərin linqvistik ifadə vasitələrini meydana çıxarmaq lazım gəlir.

Varlığın çox yaxın idrak üsulları olan bədii və publicist təfəkkürün arasında ciddi funksional fərqlər yoxdur.

Ekstralinqvistik amillər ayrı-ayrı dil səviyyələrinə məxsus vahidlərlə təzahür edir. Üslubların fərqləndirilməsində ekstralinqvistik amillərin rolu olduqca böyükdür. Onlar həmin üslublara məxsus ifadəlilik vasitələrinin formalaşmasına və standartlaşmasına həlledici təsir göstərir. Buna görə də üslublar arasındakı fərqləri məhz ekstralinqvistik və linqvistik amillərin eyni dərəcədə nəzərə alınması nəticəsində müəyyənləşdirmək mümkündür.

Ayrı-ayrı üslublara məxsus mətnlərə ümumi cəhətdən oxşar dil vahidləri çoxluq təşkil etdiyinə görə linqvistik vasitələr ilk baxışda heç bir üslubun fərqli cəhətlərini qabarıq əks etdirə bilmir. Xüsusilə bədii və publisistik üslublar arasında by fərqləri qabarıq şəkildə müəyyən etmək çətin olur bəzən.

Publisist üslubu ümumiyyətlə, "müasir sinkretik ədəbiyyat" adlandırırlar. Digər tərəfdən, publisist üslubun bir qolu da elə bədii-publisist üslubdur. Bədii publisistika siyasi, ictimai və s. aktual problemləri lirik-emosional vasitələrlə təsvir edən ədəbiyyatdır. F.Mehdiyev yazır ki, "Bədii üslubda (hekayədə) faktik material bədii obrazın yaradılmasına xidmət edirsə, publisist üslubda (məsələn, oçerkdə) əksinə, obrazlılıq faktik materialın, real həyatın daha qabarıq və obrazlı verilməsinə xidmət edir" (2, s.18).

Publisistikada obrazlılıq ilk növbədə başlıqlardan başlayır. Çünk publisist əsərin əsas məna yükünü başlıqlar daşıyır. Başlıqların təbii vasitələrlə ifadə olunması publisist əsərin təsir gücünü daha da artırır. Publisist əsərin geniş yayılmış başlıq forması şeir misrasıdır. Məsələn, “Ötən günlərimi qaytaraydılar”, “Bura Vətəndi” və s. bu kimi nümunələri göstərmək olar.

Digər başlıq forması isə metaforik ifadələrdən ibarət olur. Məsələn, M.Rahim gürcü şairi Nikolaz Barataşvilinin yaradıcılığına həsr etdiyi publisistik məqalələrindən birini “Aydın üfüqlər şəfəqi” adlandırmışdır. Məqalənin məzmunu ilə tanış olduqdan sonra bizə məlum olur ki, məqalənin müəllifi gürcü şairininin şeirlərini aydın üfüqlər şəfəqinə bənzətdiyi üçün məqaləni belə adlandırmışdır.

Bəzən publisist əsər başlığı ritmik-qafiyələnən sözlərlə verilir. Məlumdur ki, ritmik qafiyəli sözlər bədii üsluba, xüsusilə, poeziyaya məxsusdur. Lakin publisist üslubda da bəzən belə sözlərə rast gəlmək olar. Ümumiyyətlə, bütün funksional üslublar içərisində bu cür sözlərə yalnız bədii və publisist üslublarda rast gəlmək olar. Çünki bu üslubda müəllifin qarşısında bir neçə məqsəd durur: məlumat vermək, təsir etmək, əsəri maraqlı, oxunaqlı etmək və s. Bu məqsədlərə çatmaq üçün müəllif müxtəlif yollar axtarıb tapır. Elmi və rəsmi üslublarda isə oxucuların hisslərinə təsir etmək yox, oxuculara məlumat verməkdir. Publisist üslubda ritmik sözlərdən istifadə edilməsinə misal olaraq, dövri mətbu orqanların birinin səhifələrində yer almış məqalə başlığı maraq doğurur: “Ziyalı yoxsa ziyanlı?”. Burada bütün bədii-estetik və məzmun yükü məhz bu cür fonetik, ritmik element üzərindədir. “Ziyalı” və “ziyanlı” sözləri kontekst daxilində bir biri ilə əlaqədar deyil. Lakin onlar qafiyəli sözlər kimi qulağa xoş səslənirlər. Müəllifin burda başqa məqsədi var. O, müasir dövrdə Azərbaycanın bəzi ziyalılarının ictimai laqeydliyini tənqid etmək istəyir. Lakin müəllif bunu adi yolla etmir, o, başqa yol axtarıb tapır, bu sözə formaca oxşar və öz fikri ilə məzmunca səsləşən söz tapır. Bu yolla müəllif yaradıcılıq məharətini göstərir.

Publisistika obrazlılıqdan təbii ki, başlıq adı seçməklə tamamlanmır. Məsələn, S.Rəhmanın məqalələrinin birində oxuyuruq: “Musiqi kimi şeirdə ürəklərdə elə qəribə hislər yaranmasına, elə titrəyişlər əmələ gəlməsinə səbəb olur ki, bunu sözlə təsvir etmək mümkün deyil, şerin valehedici xüsusiyyətlərini şərh etmək, ürəkləri, hissləri bu qədər tez fəth etməsinin sirlərini söyləmək yenə də şeir vasitəsilə gözəl olar. Heyif ki, mən şair deyiləm”. Və ya M.Rahimin əsərindən bir parça: “Ölməz şair M.Füzulinin divanı illərdən bəridir ki, yazı masamın üstündən əksik olmur. Dönə-dönə oxuduğum bu divan artıq saralmışdır. Lakin bu sarı vərəqdəki şeirlər həmişə bahardır. Onların təravəti hər zaman insanları məst edir”. Publisistik məqalələrdən götürülmüş bu parçalar öz obrazlılığı, bədiiliyi ilə bədii əsəri xatırladır. Çünki hər iki publisistik yazı nümunəsi lirizm, obrazlılıq, deyim tərzinə görə heç də bədii əsərdən seçilmir.

Publisist üslubun bədiiliyə daha çox meyl edən janrı təbii ki, bədii publisistkadır. Dövrümüzdə bu janra olan maraq qalmaqdadır. Müəlliflər daha çox publisitik oçerkə müraciət edirlər. Lakin, bu gün felyeton janrı öz tənəzzül dövrünü yasayır.

Publisistik məqalədə yeri gəldikcə obrazlı ifadələrin işlənməsinə baxmayaraq, bədiilik, obrazlılıq ikinci plana keçir. Oçerk janrında isə bu bədiilik daha aydın şəkildə təzahür edir. Elə oçerklə məqaləni fərqləndirən əsas əlamətlərdən biri də oçerkin bədiiliyə daha çox meyl etməsidir. “Obrazlılıq – məqalənin tərkib ünsürlərindən biridir. Əgər müəllif obrazlı təfəkkürdən uzaqlaşarsa, onun məqaləsinin ədəbi-bədii təsiri azalar” (3, s.94). Publisistik məqaləyə verilən belə tələb onun bədiiliyini şərtləndirir. Publisistikanın felyeton janrında da bədii üslubla müxtəlif cəhətlərdən oxşarlıq özünü göstərir. Hətta bəzən felyetonu bədii janr hesab edənlər, onu bədii üsluba aid edənlər də var. Əslində isə felyeton publisistikanın janrıdır. Lakin bununla belə, təbiidir ki, felyetonu bədii üsluba yaxınlaşdıran, onu hətta bədii üsluba məxsus janr hesab etməyə əsas verən müəyyən cəhətlər var. Yəni, felyetonda bədii üslubun aşağıda təqdim olunan xüsusiyyətləri özünü göstərir.

Felyetonların epiloqu bədii əsəri xatırladır. Çünki burada müəllif real hadisələrə keçməzdən əvvəl əsəri daha da oxunaqlı etmək üçün nağılvari, yaxud hekayəyə oxşar bir giriş verir. Məsələn: “Bir gün aşıq libası geymiş ovçu Pirim qoltuğunda saz, Laçındakı musiqi məktəbinə gəldi” və ya “Məni niyə döyürsən, ay dədə? Əvvəl qulaq as, gör internatdan niyə qaçmışam, sonra nə qədər istəyirsən, kötəklə”.

Felyeton müəllifi felyetonda bədii obrazlardan istifadə edir. “Kirpi” jurnalında “Lağlağı” imzası ilə yazan müəllif “Xortdanın cəhənnəm məktubları” adlı felyetonun qəhrəmanını mifik obraz olan Xortdanın adı ilə adlandırmışdır. Ə.Hüseynzadə isə “Kirpi” jurnalında çap olunmuş felyetonunun adını “Şeyx Sənan” qoymuşdur və felyetonun baş qəhrəmanına da bu adı vermişdir. Xalq yazıçısı S.Rəhimov rabitə və poçt işçilərini tənqid etdiyi felyetonunda C.Məmmədquluzadənin “Poçt qutusu” qəhrəmanı olan Novruzəli surətini yeri gəldikcə xatırladır.

Müxtəlif ədəbi-bədii surətlərdən istifadə edən publisistlərin əksəriyyəti həmin surətləri ön plana çəkərək, əsərlərinin başlığında da həmin adlardan istifadə etmişlər: “*Xortdanın* cəhənnəm məktubları”, “*Şexs Sənan*” və s. Publisistikanın analitik janrında da bədiilik nümunələri özünü göstərir. Lakin nəzərdən

qaçırmaq olmaz ki, "informativ və analitik janrlarla müqayisədə oçerk, felyeton, pamflet, memuar və zarisovkada "bədiilik" ifadəliliyin əsas ağırlığını daşıyır" (4, s. 21).

Publisist əsərlərin əvvəlində və sonunda bədii üsluba məxsus təsvirlər, ya daxili psixoloji vəziyyəti əks etdirən proloqlar, epiloqlar olur: publisist oçerklərdə, məqalələrdə, xatirələrdə bəzən haqqında yazılan şairin epiloq kimi istifadə edilir. Məsələn, M.Rahim S.Rüstəmə həsr etdiyi oçerki, onun (S.Rüstəmin) şeirində götürülmüş misra ilə başlamışdır: "Oxuyun, bir qızıl kitabəm mən". Tarixə ekskurs etsək görərik ki, belə bir xüsusiyyətə "Molla Nəsrəddin" jurnalının da səhifələrində rast gəlmək olurdu. Məsələn, C.Məmmədquluzadə "İran konsulları" adlı felyetonunu Şakinin bir beyti ilə başlayır (5, s.130).

Publisist üslubda istifadə olunan bədii üslub xüsusiyyətlərindən biri də alleqoriyadan və simvollardan istifadə olunmasıdır. Publisist ədəbiyyatda son dövrlərdəki müharibə ilə əlaqədar erməniləri "qanlı pəncəli vəhşi", "qana susamış yırtıcı", "quzğun" və s. adlandırırlar. Yeri düşmüşkən qeyd edək ki, "quzğun" sözü Azərbaycan publisistikasında simvolik bir termin kimi xüsusi tarixə malikdir. M.Məmmədov bu söz haqqında yazır: "Azərbaycan publisistikasında "quzğun" sözündən "Vətən torpağını didən, parçalayan, xalqın var-dövlətini sökub-dağıdan, bədxah, riyakar, qaniçən, murdar, qəddar adamların obrazı – prototipi kimi çox istifadə olunmuşdur" (6, s.396). Digər nümunələrə də diqqət yetirək: "20 Yanvar" rus ordusunun Azərbaycana təcavüzünün simvolu kimi işlənir. Məlumdur ki, Azərbaycanda bu təcavüz 1990-cı il yanvarın 20-də olub. Litvada isə bir il sonra, lakin yanvarın 13-də olub. Məqalə müəllifi Litvadakı bu zorakılıqdan bəhs edən məqaləsinin adının "13 yanvar, Riqa" yox, məhz "20 yanvar, Riqa" qoyub. Hər bir azərbaycanlı oxucu bu başlığa baxanda, məqalə məzmunun Riqada 13 yanvardakı hadisələrlə bağlı olduğunu dərhal başa düşür. Çünki yuxarıda dediyimiz kimi, "20 yanvar" Bakıya rus ordusunun təcavüzünün simvoludur. Müəllif isə məqaləni belə adlandırmaqla, başlığı emosional cəhətdən güclü, obrazlı etmişdir. Burada alleqoriyadan istifadə edilməsi – haqqında danışılan tərəfə güclü nifrətin, coşqun mənfi hisslərin bildirilməsi üçündür.

Publisist üslubun bədii üsluba təsirindən danışarkən ilk növbədə, bədii ədəbiyyatın bir janr olan şeir-oçerkin adını çəkmək lazımdır. Son vaxtlar, xüsusən, Qarabağ və onun ətrafında baş verən döyüşlərlə əlaqədar yaranan şeir və poemalar ayrı-ayrı qəhrəmanlar haqqında lirik oçerklərə bənzəyir (məsələn, şair Xəlil Rzanın Qarabağ ətrafındakı döyüşlərdə həlak olmuş oğlu Təbrizə həsr etdiyi şeir kimi). Şeir-oçerk haqqında M.Mahmudov belə yazır: "şeir-oçerk real, konkret insan fəaliyyəti bədii ədəbiyyata məxsus obrazlılıqla birləşir, qaynayıb-qarışır" (7, s.9). Durğunluq dövründə şeir-oçerk ədəbiyyatımızda özünə geniş yer tapmışdı. Ayrı-ayrı tarla qəhrəmanlarının şəninə qoşulan mədhiyyələr buna sübutdur. Bəzən onlar həddindən artıq çağırışçı, quru xarakter daşıyırdı. Tarixi-ictimai formasiyaların dəyişməsi ədəbiyyatın bu janrına da öz təsirini göstərdi. Lakin bu janr – şeir-oçerk yenidən müasir dövrümüzdə nəşət etməli və həqiqi qəhrəmanları vəsf etməlidir. Bədii üslubda yeri gəldikcə, qəhrəmanların sənəti, danışıq tərzi və s. ilə əlaqədar olaraq publisist ünsürlərdən, hətta publisist janr formasından istifadə olunur. Y.Səmədoğlunun "Qətl günü" romanı başdan-başa yazıçı gündəliyindən götürülmüş parçalarla doludur. Əsərdə publisist janr olan gündəlik haqqında müxtəlif fikirlərlə yanaşı, gündəliyin ümumi məzmunu da verilmişdir. Lakin bir daha qeyd etmək istəyirik ki, publisist üslubun xüsusiyyətləri bədii üslubda, bədii üslubun xüsusiyyətlərinin publisist üslubda yayıldığı qədər geniş yayılmayıb.

**Ədəbiyyat:**

1. A.Quliyeva. Üslublar arasındakı qarşılıqlı əlaqələr. Bakı, Elm, 2002
2. Ф.Мехтиев. Проблемы мастерства в художественной публицистике. АДД, Баку, 1973, s.18
3. Jurnalistika məsələləri. Bakı, Maarif, 1972.
4. Əbdürəhimova C. Qəzet satirasının əsasları. Bakı, ADU-nun nəşriyyatı, 1991
5. "Molla Nəsrəddin". 12 cilddə (1906-1907). Bakı, Elm, 1988,
6. M.Məmmədov. Nərimanovun publisist üslubu. Bakı, Yazıçı, 1985
7. Махмудов М. Вопросы литературы в азербайджанской прессе, АКД, Баку, 1974

**The interaction between the belles-lettres style and publicist style**

**Summary**

The language is a system of styles. Every style is characterized by its peculiar features .But no style can exist in isolated form in the language. There is a interaction between all styles. This type of interaction also exists between the belles-lettres style and the publicist style.First of all, this interaction comes from the use of lexis which serves to create artistry and figurativeness. The characteristic features of the publicist style is not widely spread in the belles-lettres style as the characteristic features of the belles-lettres style in the publicist style.

**Взаимосвязь художественного и публицистического стилей**

**Резюме**

Язык–это система, состоящая из стилей. Каждый стиль обладает характерными особенностями. Но ни один из стилей не может существовать в языке в изолированной форме. Между всеми литературными стилями существует взаимная связь. Взпимная связь существует и между художественным и публицистическим стилем. Эта связь в первую очередь проявляется в использовании образной и художественной лексики. Но особенности художественного стиля в публицистике используются намного больше, чем особенности публицистического стиля в художественном стиле.

**Rəyçi: dos.Ş.Ağakişiyeva**

## ƏDƏBİYYATŞÜNASLIQ LITERARY STUDIES ЛИТЕРАТУРОВЕДЕНИЕ

**Rövşən Ramizoğlu**
Səlcuq Universiteti (Konya, Türkiyə)
rovshan@selcuk.edu.tr

# POEZİYAYA VERİLƏN BİR-BİRİNƏ ZİDD MÜXTƏLİF TƏRİFLƏR FONUNDA POETİK TƏRCÜMƏ MƏSƏLƏLƏRİNİN TƏHLİLİ

***Açar sözlər:*** *poeziya, poetik tərcümə,müəllif mətni, tərcümə mətni*
***Key words:*** *poetry, poetic translation, author's text, translation text*
***Ключевые слова:*** *поэзия, поэтический перевод, авторский текст, текст перевода*

Tanınmış rus şairi Samuil Marşak poetik tərcümə haqqında bunları yazır: "Şeir tərcüməsi ali və çətin sənətdir. Mən ilk baxışdan paradoksal görünən, amma mahiyyətcə dəqiq iki müddəa irəli sürərdim:

Birinci. Şeir tərcüməsi mümkün deyil.

İkinci. Bu, hər dəfə istisnadır. Əgər tərcüməçi öz işinə məhz bu cür yanaşırsa (əslində, təkcə tərcüməçi yox, həm də hər bir şair), o nəyəsə nail ola bilər.

Doğrudan da, nə isə alınanda bu necə də böyük xoşbəxtlik olur!" (1).

Digər rus şairi V.Bryusovun dedikləri də Marşakın fikirləriylə səsləşir: "Şairin yaratdığını bir dildən başqa bir dilə çevirmək qeyri-mümkündür; amma belə bir istəkdən vaz keçmək də olmur" (2, 188).

A.Mejirov "Literaturnaya qazeta"da çap etdirdiyi "Tərcümə meydanlarında" adlı məqaləsində poetik tərcüməyə şeirlə münasibət bildirir:

"Yenidən,
Mavi tüstüdən,
Yaranır poeziya.
Onu tərcümə etmək
Mümkün deyil heç cürə.
Çünki o sadiqdir,
Həmişə ana dilə" (3).

Bu məsələylə bağlı tanınmış alman filoloqu Villamovis-Möllendorfun fikirləri isə bir qədər fərqlidir. O, özünün "Tərcümə nədir" məqaləsində bədii tərcümənin mümkünlüyünü əsaslandırmağa çalışır və bədii tərcümədə, xüsusilə də şeir tərcüməsində orijinalın yaratdığı təəssüratları, hissləri təkrarlaya bilən vasitələr seçməklə şeri tərcümə etməyin mümkün olduğunu vurğulayır.

Amma bununla belə tərcümə nəzəriyyəçilərinin tədqiqat işlərinə nəzər salsaq Villamovis-Möllendorfun yox, məhz Marşak və Bryusov kimi düşünənlərin çoxluq təşkil etdiyini görərik. Məsələn, B.Tomaşevski özünün "Şeir və dil" kitabında alman filoloqun fikirləri ilə ziddiyyət təşkil edən mövqeyini ortaya qoyur və yazır: "Şeir nə qədər spesifik və fərqli olsa da, onun quruluşu yalnız bir dilə məxsusdur və bu dilin milli formalarından kənarda o təkrarolunmazdır. Məhz bu səbəbdən poeziya həmişə incəsənətin ən milli forması olaraq qalıb" (4, 68).

İtalyan şairi Dante poetik əlaqədən doğmuş harmoniya olan şeri bir başqa dilə tərcümə edərkən bu harmoniyanın tamamilə pozulduğunu, şerin dadının qaçdığını deyir. Bu fikrə Volter, Servantes, Şatobrian və digərləri də şərik çıxırlar. Onlar poetik tərcüməni "xəyanət" adlandırırlar.

Pol Valeri də pessimistlər sırasında durur və poetik tərcüməyə bu cür qiymət verir: "Şeir tərcümədə artıq onu yazanın əsəri olmur. Mənim şeirlərim çox dillərə, hətta çin dilinə də tərcümə olunub. Amma oxuyanda mən onları tanımıram" (5, 88).

"Traduttori traditori" ("tərcüməçilər xəyanətkarlardı") – italyanların belə bir məşhur deyimi var. Joakim De Bölün fikirləri bu məşhur deyimlə çox səsləşir. O, şeir tərcüməçiləri haqqında danışarkən onların müəlliflərə xəyanət etdiklərini, onları hörmətdən saldıqlarını deyir. De Böl öz bacarıqsız əllərini poeziyaya uzadan bu cür tərcüməçiləri qınayır və hesab edir ki, müqayisələri, alleqoriyaları, metaforaları, antonimləri, sinekdoxaları, kataxrezləri və nəzm əsərlərində rast gəlinən digər fiqurları və bəzəkləri tərcüməçi tərcümə edə, mətni müəllif kimi cazibəli yarada bilməz.

Göründüyü kimi poetik tərcümə problemi tərcüməşünaslığın ən aktual problemlərindən biri kimi həmişə özünə diqqət cəlb edib. Bu gün də bir çox tanınmış şair və yazıçılar, tərcümə nəzəriyyəçiləri poetik tərcüməyə qarşı çıxırlar və bir insanın keçirdiyi hissləri başqa birisinin də keçirməsi mümkün olmadığı kimi, şerin gözəlliyini və cazibəsini də digər bir dilə tam köçürməyin qeyri-mümkün olduğunu söyləyirlər.

Ancaq tərcümənin mümkünlüyünü rədd etmək ümumilikdə milli ədəbiyyatın, mədəniyyətin inkişafının qarşısını almaq deməkdir. Çünki məhz tərcümə əsəri öz oxucusuna müqayisə aparmaq imkanı yaratmaqla bu inkişafa təkan verir. Dediklərimizi əsaslandırmaq üçün burada xalq şairi Ramiz Rövşənin bir fikrini misal çəkmək yerinə düşər: "Dünyanın neçə-neçə gözəl şairinin, yazıçısının əsərləriylə tanış olandan sonra oxucu bizim öz şairlərimizin, yazıçılarımızın qiymətini daha aydın başa düşəcək, öz içində qapanıb qalan oxucu zövqünün qabığı çatdayacaq, gözləri açılacaq və ucsuz-bucaqsız dünya ədəbiyyatının genişliyində oxucu birdən-birə bu günəcən ona çox nəhəng görünən bir çox ədəbi vücudlarımızın xırdalığını, heçliyini-puçluğunu anlayacaq, bu günəcən görmədiyi ellərdə, bilmədiyi dillərdə yazıb-yaradan neçə-neçə gözəl şairin, yazıçının ona doğmalığını, məhrəmliyini duyacaq və mən inanıram ki, bu qazancın sevinci o itkinin ağrısından daha çox olacaq" (6, 110).

Tərcümənin, xüsusilə də şeir tərcüməsinin qeyri-mümkünlüyünü, lazımsızlığını söyləyənlər oxucunu bir növ bu sevincdən məhrum etməyə çalışırlar.

Poetik tərcümənin qeyri-mümkünlüyünü iddia edənlərdən fərqli olaraq şeir tərcüməsinin mümkünlüyünü və vacibliyini söyləyən fransız tərcümə nəzəriyyəçisi Jorj Munyen özünün "Etibarsız gözəllər" kitabında yazır: "Bu gün şeir tərcüməsinin qeyri-mümkünlüyü ilə bağlı fikirlər anaxronizm kimi səslənir – artıq mədəniyyətin məqsədinin Homeri, Horasini, Petrarkanı və hərdən də Lopa de Veqanı orijinalda oxumaq olduğu dövrlər arxada qalıb" (5, 90).

Amma tərcüməyə gəlməyən şeirlərin olmadığını demək də bizcə düzgün deyil. Şair Ramiz Rövşən bununla bağlı yazır: "…Çoxdan bəri belə bir arzum var: Puşkindən bu günəcən, ən çox sevdiyim rus şairlərinin ən çox sevdiyim şeirlərindən bir silsilə tərcümə eləmək. Bu silsilədən artıq tərcümə elədiyim şeirlər də var, tərcümə edə bilmədiyim şeirlər də. Məsələn, böyük rus şairi Pasternakın bir şeri üstündə neçə ildir əlləşirəm, bir şey çıxmır. O şeir məndən söz-söz keçib, mən də o şeirdən söz-söz keçmişəm, o şeirdəki heç bir misranın, obrazın, təşbehin məndən ötrü sirri qalmayıb, sirli qalan təkcə hardansa o şerə düşən bir qəribə işıqdır. O işıq o şerin hər sözündə, hər misrasındadır. Hər dəfə o şeri tərcümə eləyəndə sözlər, misralar hamısı əlimə gəlir, təkcə o işıqdan savayı" (7).

Doğrudan da hər bir əsərin məğzində onun müəllifinin individual yaradıcılıq üslubu, poetik mədəniyyəti durur. "Ələ gəlməyən" o işıq da çox vaxt məhz bu üslubdan, mədəniyyətdən qidalanır. Bütün bu amillər tərcümə prosesi zamanı tərcüməçi üçün müəyyən çətinliklər yaradır.

Amma poetik tərcümənin mümkünlüyünü həm qəbul, həm də rədd edən şair və yazıçılar, tərcüməçilər, ədəbiyyatşünaslar bu günəcən poeziyaya ümumi bir tərif verməyə, onun mahiyyətini açmağa cəhd göstəriblər. Pessimistlərin müəyyənləşdirdiyi bu cür təriflərdən ən geniş yayılmışı "poeziya – tərcümə zamanı itən yaradıcılıq növüdür" fikridir. Geniş yayılmış digər bir mücərrəd fikirdə poeziya "tanrıların dili" adlandırılır. Qurani Kərimin "Şuara" surəsində bu "dili" bilənlər, yəni şairlər haqqında bunlar yazılıb: "Şairlərə sapmışlar, pərəstişkar adamlar tabe olarlar. Məgər görməmisənmi, bir söz vadisindən o birinə keçərkən onlar necə hədlərini aşırlar (yəni nə həcv, nə də mədhiyyə qoşmaqda sərhəd gözləmirlər). Eləmədiklərini "eləmişik" deyərlər… Ancaq başqa şairlər də var, bunlardan deyil onlar. O şairlər ki, iman gətiriblər, saleh işlər görüblər. Allahı tez-tez anıblar, zülm çəkəndən sonra uğur qazanıblar" (8, 187).

Məşhur ispan şairi F.Q.Lorka poeziya haqqında bunları deyir: "Poeziya abstrakt deyil, onun varlığını mən çox real şəkildə hiss edirəm. Mənim şeirlərimin bütün qəhrəmanları real, canlı insanlardır. Ən əsası reallığın poetik açarını tapmaqdır. Adətən bu, ən az gözlədiyin bir vaxtda baş verir. Açarı bir dəfə fırladırsan və… artıq şerin parıltısı görünür" (9, 149).

Xalq şairi Rəsul Rza isə poeziyanı bu cür xarakterizə edir: "Poeziya, təbii hisslər axarının tədriclə şer ahənginə düşməsi – demək, ruhca oyanmağa, sivilizasiya mərhələsinə qədəm qoymağa başlayan xalqın poetik təfəkkürünün (yəqin ki, ilk əvəllər kortəbii şəkildə) yaranması nəticəsində meydana gəlib" (10, 430).

Bununla bağlı şair Ramiz Rövşənin fikirləri də maraqlıdır: "Doğrudan da, şeir necə doğulur? Şairlik nədi?

Qədim yunan dilində şairlik sözünün mənası "iş görmək" deməkdi. İndiyəcən bu dünyada şair haqqında deyilmiş ən məşhur kəlamda da "iş" adı çəkilir: "Şairin sözü – onun işinin məğzidi".

Amma şairlik işdimi?

Bu dünyada məqsədsiz heç bir iş görülmür, hər görülən iş hansı məqsədə çatmaq üçünsə bir vasitədi. Amma əsl şairdən ötrü poeziya vasitə deyil, məqsəddi.

Kant poeziyanı "Fikirlərin bədii oyunu" sayırdı.

Və deməli, şeir yazanda şair "işçi"dən daha çox, "oyunçu"du. Oyun qurtarıb iş başlayan yerdə poeziya ölür" (11).

Xalq yazıçısı Afaq Məsudun fikirləri də bir növ Kantın fikri ilə səsləşir. A.Məsud ümumiyyətlə ədəbiyyatı belə xarakterizə edir: "Ədəbiyyat da böyük mənada oyundu" (12, 569).

Hər bir şair öz xalqının bənzərsiz mənəvi dəyərlərini konkret bir milli dil vasitəsilə ifadə edir. Bunu nəzərə alıb poetik tərcümənin qeyri-mümkün olduğunu söyləmək nə dərəcədə düzgündür? Bir çoxları incəsənəti və xüsusilə də poeziyanı möcüzə sayırlar. Əgər şair bədii söz tilsimindən istifadə edib bu möcüzəni yarada bilirsə, nəyə görə istedadlı tərcüməçi bu möcüzəni digər bir dilin emosional-estetik təsir vasitələrindən istifadə etməklə yenidən yaratmamalıdır?

Poeziya tərcüməçisi insan ruhunun mürəkkəbliyini, həssaslığını, bənzərsizliyini əks etdirən çox incə materialla işləməyi bacarmalıdır. Məhz bu amil tərcümədə poetik informasiyanı oxucuya çatdırmağı çətinləşdirir. Əgər şair şeirdə keçirdiyi hisslərdən söz açırsa, bu hissləri üstüörtülü şəkildə vərəqə köçürürsə tərcüməçinin işi bir az da dolaşığa düşür. Bu zaman tərcüməçi poeziyanın “sirri” qarşısında aciz qalır, onun gözəlliyini oxucuya necə çatdırmalı olduğunu bilmir. Ancaq bizcə, bunu poetik tərcümənin qeyri-mümkünlüyünü iddia etməyə əsas verən çıxılmaz vəziyyət kimi qiymətləndirmək də düzgün deyil.

Əsl poeziya həmişə sirrdir. Poeziyanın sirri onun məhz emosional-estetik təsir gücündə, musiqili məğzindədir. Bu musiqi onun ümumi quruluşunda, hər bir misrasında, hər bir qafiyəsində səslənir. Şeirdəki sözlərin bu musiqisi bizim emosiyalara hər şeydən çox təsir edir.

Əslində, istənilən ədəbi əsər kimi poetik əsər də müəllifin öz oxucusuna çatdırmaq istədiyi informasiyaların cəmidir. Şerin informativ yükü digər ədəbi əsərlərin informativ yükündən daha “ağırdır”. Şeirdə cəm halında bütöv sistem yaradan hər bir element – forma, məzmun, leksika, surətlər toplusu, ritm, ölçü, qafiyə – özündə müəyyən informasiya daşıyır. Və yalnız bütöv şəkildə poetik əsər tam estetik dəyərə sahibdir. Deməli, poetik əsər bütün digər amillər də nəzərə alınmaqla məzmun və formanın qarşılıqlı əlaqəsindən yaranan bitkin informativ sistemidir.

Poeziyada musiqili ritm sanki sözlərin, qafiyələrin, misraların zənciri ilə zəncirlənir. Poetik əsəri tərcümə edərkən onun bu səciyyəvi xüsusiyyətini əsas götürmək lazımdır. Zəncirin həlqələrindən birini ixtisar etmək və ya ona bir-iki yeni həlqə qoşmaq qəbahət sayılmır. Əsas məsələ həmin o musiqili ritmi tutmaq, onu yeni bir dilin ifadə vasitələri ilə yenidən yaratmaq, bir sözlə, zəncirin bütövlüyünü qoruyub saxlamaqdır. Bu prinsipi poetik tərcümə şərtlərinin və prinsiplərinin təməli kimi qiymətləndirmək olar.

Təcrübə göstərir ki, tərcüməçi poetik tərcümə zamanı əsərə çox vaxt orijinalın ruhuna uyğun yeni sözlər əlavə etmək, onun formasını, şeirdəki misraların sayını dəyişmək məcburiyyəti qarşısında qalır. Bu isə aydın məsələdir ki, şerin ölçülərinə, emosional gücünə öz təsirini göstərir. İstedadlı tərcüməçinin bu əlavələri poeziya nümunəsinin emosional-estetik təsir gücünü daha da artırır. Belə əsərlərin formasının və ya həcminin dəyişməsi elə də böyük qəbahət sayılmır. Amma onların emosional-estetik təsir gücünün zəifləməsi ümumilikdə tərcümənin keyfiyyətinin aşağı düşməsinə səbəb olur.

Şeirdə hər bir misranın arxasında müəyyən bir fikir gizlənir. V.Belinskinin sözləri ilə desək “Hər bir poetik əsər şairin canına dolan nəhəng bir fikrin məhsuludur” (13, 377). Bu səbəbdən bədii söz ustası kimi tərcüməçi ilk növbədə əsərin bədii gücünün qorunub saxlanılmasına fikir verməli, hissləri və fikirləri şair qədər estetik cəhətdən cazibəli təsvir etməli, oxucuya çatdırmalıdır. Çünki poetik tərcümə məğzi etibarilə estetik prosesdir. Xalq yazıçısı Kamal Abdulla özünün “Kədərli seçmələr” kitabında poetik tərcümə prosesini belə təsvir edir: “Əsl poeziya tərcüməsi odur ki, orijinalın ümumi ruhu və ahəngi ilə bərabər mətndəki xüsusi incəlikləri də verə biləsən. Başqa sözlə, əsasən orijinalın ümumi ruhunu tutmaq vacibdir. Bununla yanaşı, bu ümumi ruhu elə incə ştrixlərlə bəzəmək lazımdır ki, ruhun özü canlı bir orqanizm kimi yaşasın” (14, 166).

Professor Hamlet İsaxanlı isə poetik tərcüməni bu cür xarakterizə edir: “Poeziyanın məqsədi fikri ritmik, yığcam və gözəl şəkildə söyləmək isə, tərcümənin də məqsədi, yəqin ki, eyni olmalıdır, məgər tərcümə bir dildə yaranmış fikri və gözəlliyi digər dilə inikas etmək deyilmi? Başqa sözlə desək, poetik tərcümənin ali məqsədi orijinaldakı həmin fikri ritmik, yığcam və gözəl şəkildə (bənzər gözəllikdə, mümkün qədər çox oxşar şəkildə!) hədəf dildə yenidən ifadə etməkdən ibarətdir” (15, 254).

Poetik tərcüməyə bu cür yanaşma tərcüməçinin tərcümə prosesi zamanı yaradıcılıq azadlığına, interpretasiya etmək hüququna malik olduğunu önə çəkir. Belə ki, poeziya tərcüməsi elə poeziya interpretasiyası deməkdir. Ancaq həm yaradıcılıq azadlığını, həm də, interpretasiya etmək hüququnu əsas tutaraq tərcüməçi bədii əsərin estetik təsirini zəiflətməməlidir. O, bu təsirin qorunmasını qarşısına bir məqsəd kimi qoymalıdır. Yalnız bundan sonra tərcüməçi öz azadlığının sərhədlərini müəyyənləşdirməli, interpretasiya etmək imkanlarını götür-qoy etməlidir.

Yuxarıda qeyd etdiyimiz həm bir-biri ilə səsləşən, həm də bir-birini inkar edən fikirlərdən də göründüyü kimi bu məsələdə hansısa bir ümumi resept tapmaq mümkün deyil. Hər şey tərcüməçinin şüurunda formalaşan konsepsiyadan asılıdır. Bu konsepsiya tərcüməçiyə bir növ düzgün yolu tapmaqda köməklik göstərir.

Tutaq ki, tərcüməçi öz konsepsiyasına uyğun olaraq şeir tərcüməsində Azərbaycan poeziyasında az işlənən şeir ölçüsünü daha işlək ölçüylə əvəzləyir. Bizim fikrimizcə bunu yalnız alqışlamaq lazımdır. Məlumdur ki, bizim poeziyamızdakı şeir ölçüləri qərb şeir ölçülərindən fərqlənir. Buna şifahi xalq ədəbiyyatımızın, poeziya ənənələrimizin də böyük təsir göstərdiyini deməliyik. Bu mənada Azərbaycan poeziyası daha çox Şərq poeziyasına doğmadır. Deməli, tərcüməçi nə ritmi, nə qafiyəni, nə şeir ölçülərini, nə də mətni tərcümə etməlidir. O, orijinal mətndən aldığı təəssüratları öz ana dilində oxucusuna çatdırmalıdır. Tərcüməçinin uğuru məhz orijinal mətndən alınan bu emosional təsiri nə dərəcədə oxucuya çatdıra bilməsindən birbaşa asılıdır. Görkəmli rus yazıçısı A.K.Tolstoy bu məsələylə bağlı yazır: "Mən sizi əmin edirəm ki, orijinalın təəssüratını tərcümə eləmək lazımdı. Və buna görə də, bəzi tərcümələr şairin fikirlərini onun özündən daha yaxşı əks etdirə bilər" (16, 137).

Türkiyə şairi Ataol Bəhrəmoğlu isə öz müsahibələrindən birində deyir: "Şeir tərcüməsinə baş vuran adamın bir şeyi əvvəldən bilməsi və anlaması lazımdı: tərcümə həm əslinə sadiq olmalıdı, həm də əslinə sadiq olma imkanı mümkün deyildir." (17, 288).

Tanınmış tərcümə nəzəriyyəçisi Q.V.Plexanov isə ümumiyyətlə tərcümə haqqında danışarkən bunları deyir: "Siz tərcümə etmək istəyirsiniz? Bu yaxşı niyyətdir. Amma yaddan çıxarmayın ki, siz birincisi, hansı dildən ki, tərcümə edirsiniz o dili; ikincisi, hansı dilə ki, tərcümə edirsiniz o dili bilməlisiniz; üçüncüsü, tərcümə etdiyiniz əsərdə söhbət açılan obyektə yaxşı bələd olmalısınız. Əgər bu şərtlərdən hansınasa əməl etməyəcəksinizsə, ələ qələm almasanız daha yaxşı olar. Çünki bu halda sizin tərcüməniz uğursuz alınacaq və siz yalnız oxucunu çaşdıracaqsınız" (18, 598).

Q.V.Plexanov bu məşhur fikrində üç əsas şərt müəyyənləşdirir. Hər iki dili bilməyin vacibliyi bir növ heç kimin heç vaxt inkar etmədiyi aksiomdur. Bununla bağlı Fəridə Vəlixanova yazır: "Dil problemi həm də ona görə daha qabarıq nəzərə çarpır ki, dili bilmədiyi halda tərcüməçinin tərcümə etdiyi şairin individual üslubunun mahiyyətini dərk etməsi, sözün stilistik çalarlarını duyması çətinləşir" (19, 175).

Ancaq bizcə Plexanovun qeyd etdiyi bu üç şərtə əməl etməklə də iş bitmir. Tutaq ki, tərcüməçi onun qarşısına qoyulan tələblərin hamısına əməl edib: o həm orijinal mətnlə, həm bu mətnin müəllifinin üslubu ilə yaxından tanış olub, orijinalın məxsus olduğu milli ədəbiyyatı dərindən öyrənib, həm orijinalın dilini, həm də tərcümə dilini mükəmməl səviyyədə bilir, orijinalı düzgün başa düşməsi üçün bütün lazımi məlumatları toplayıb, əsəri tərcümə etməyə hazır olduğunu daxilən duyub. Əslində, bütün bunlar hələ ələ qələm alıb əsəri tərcümə etməyə başlamaq üçün kifayət deyil. Bununla bir növ tərcümə prosesinin ilkin - tədqiqat, hazırlıq mərhələsi tamamlanır. İkinci mərhələdə tərcüməçi tərcümə etdiyi əsərin ümumi konsepsiyasını ən xırda detallarına qədər nəzərdən keçirməlidir. Yalnız bundan sonra yaradıcılıq mərhələsi başlayır, çətinliklər ortaya çıxır: məzmun və forma vəhdəti çoxlu kiçik hissələrə parçalanır, müəllifin üslubunun müxtəlif dil qatlarının qarışığından ibarət olduğu aydınlaşır, anlayışlar və obrazlar sistemləşməyə gəlmir. Deməli, tərcümədə, xüsusilə də şeir tərcüməsində prosesin özünə təsir edən başqa bir amil də var.

Bizcə, bütün bu çətinlkiləri həll etməkdən ötrü "üçüncü dil"i - poeziya dilini bilmək daha vacibdir. Dediklərimizi əsaslandırmaq üçün burda bir klassik nümunəni misal çəkmək istərdik: Homer Gözəl Yelenanın obrazını yaradarkən adi üsullardan istifadədən imtina edib. O, Yelenanın zahiri gözəlliyini sözlə təsvir eləmir, onun gözünün, saçlarının nə rəngdə olduğunu yazmır. Bununla da şair öz qəhrəmanının vizual görünüşünü müəyyənləşdirməyi oxucunun ixtiyarına buraxır, ona öz fantaziyasını işlətməyə imkan verir. Bu səbəbdən Yelena surətinin "üçüncü dil", sirli poeziya dili vasitəsilə yaradıldığını demək olar. Məhz poeziya dilini bilən tərcüməçi bir başqa dildə Gözəl Yelena obrazını Homer səviyyəsində yarada bilər.

İki dil öyrənmək elə də çətin iş deyil. Amma "üçüncü dili" bilən peşəkar tərcüməçilərə çox az-az rast gəlinir. Yalnız belə tərcüməçilər öz yaradıcı təfəkkürləri sayəsində tərcümə etdikləri şairin individual üslubunun mahiyyətini dərk etməyə, orijinalın bütün incə çalarlarını tərcümə dilində canlandırmağa qadirdirlər.

Amma burada tərcümə prosesinə təsir göstərən digər bir amilin olduğunu da qeyd etməliyik. Bu, tərcüməçinin informasiya baqajıdır. Poeziyanın və poetik tərcümənin özünəməxsusluqları haqqında danışarkən M.Volkşteyn bədii əsəri bütöv şəkildə bir başqa dildə yaratmaq üçün tərcüməçinin informasiya baqajının zəngin olmasının vacibliyini vurğulayır. Bu informasiya baqajını o, tərcüməçinin şüurundakı tezaurus (latınca – dəfinə) adlandırır. Poetik əsəri oxuyub anlayandan, ondan estetik zövq alandan sonra tərcüməçi öz tezaurusundan istifadə etməklə onu bir başqa dilə çevirir. Əgər onun tezaurusunun həcmi lazımi səviyyədə deyilsə, bütün incə çalarları ilə birlikdə keyfiyyətli tərcümə əsəri yaratmaq mümkün olmayacaq.

Digər tərəfdən bu məsələdə oxucu tezaurusu da az rol oynamır. Tezaurus poetik əsəri, eləcə də onun tərcüməsini dərk edə, qavraya, oxuduğu əsərdən estetik zövq ala bilməsi üçün oxucuya böyük kömək edir. Oxucunun informasiya baqajı kasaddırsa o, müəllifin orijinal əsərdə, tərcüməçinin isə tərcümə əsərində yaratdığı "incə çalarları", eyhamları duyub başa düşməyəcək.

## Ədəbiyyat:

1. Маршак С.Я. Поэзия перевода. «Литературная газета», 1962, 31 мая.
2. Брюсов В.Я. Избранные сочинение. В 2-х т. Т. II. М.: Гослитиздат, 1955, 650 с.
3. Межиров А. На полях перевода. «Литературная газета», 1963, 21 декабря.
4. Томашевский Б.В. Стих и язык. М.: Гослитиздат, 1959, 471 с.
5. Данчев Н. Три въпроса от теорията и практиката на художествения превод // Изкуството на превода. София: Народна култура, 1976, 340 с.
6. Rövşən R. Dünya bircə qarış deyil // "Xəzər" jurnalı, 1990, №1, s. 110-119
7. Rövşən R. Sənət düşüncələri. "Azərbaycan" qəzetinin xüsusi buraxılışı, Bakı, 1993, mart, №10
8. Qurani Kərim. Bakı: Azərbaycan nəşriyyatı, 1993, 368 s.
9. Lorka F. Qarsia. Lorka ilə söhbət // "Xəzər" jurnalı, 2006, №3,s. 149-152
10. Rza R. Seçilmiş əsərlər. V cilddə, V c., Bakı: Azərnəşr, 458 s.
11. Rövşən R. Göy üzü quşlarla şairlərindi. "525-ci qəzet", Bakı, 1996, mart, №08
12. Məsud A. Roman, esse, hekayə. Bakı: Azərbaycan Tərcümə Mərkəzi, 1999, 640 s.
13. Белинский В.Г. Собрание сочинений. В 3-х т. Т III, М.: ГИХЛ, 1948, 928 с.
14. Abdulla K. Kədərli seçmələr. Bakı: Mütərcim, 2002, 548 s.
15. İsaxanlı H. Poetik tərcümə. Məhdud çərçivələr içində xoş ahəng və gözəllik axtarışı // "Dünya ədəbiyyatı" jurnalı, 2005, № 2, s. 229-272
16. Толстой А.К. Полное собрание сочинений. В 4-х т. Т.IV, Спб.: Издание А.Ф. Маркса, 1908, 316 с.
17. Bəhramoğlu A. Majora yüksələn (şair Ataol Bəhrəmoğlu ilə müsahibə) // "Dünya ədəbiyyatı" jurnalı, 2005, № 2, s. 285-289
18. Плеханов Г.В. Литература и эстетика. В 2-х т. Т I. М.:ГИХЛ, 1958, 616 с.
19. Велиханова Ф. Русские переводы поэзии Самеда Вургуна. Баку.: Из-во Ан Азерб. ССР, 1969, 181 с.

## Analysis of the problems of poetic translation in the light of opposite definitions given to poetry

### Summary

Poetic translation is researched as the one of the actual problems of modern studies of translation according to the opinions by different translators related to poetic translation. The evidences given by people who argue for possibility and impossibility of poetic translation are analyzed. It is stated that poetic translator should be able to work with delicate materials reflecting the complexity, sensitivity and uniqueness of human spirit, the point which makes it difficult for translators to deliver poetic information to readers. That being said, the final conclusion is that this difficulties cannot make poetic translation impossible.

Also, poetic translation is examined as a special branch of poetry in the article.

## Анализ вопросов поэтического перевода на фоне различных противоречащих друг другу определений поэзии

### Резюме

В статье на основе примеров различных подходов переводоведов к данному вопросу, поэтический перевод исследуется как один из актуальных проблем современного переводоведения. Анализируются аргументы сторонников и противников поэтического перевода. Подчеркивается, что переводчик поэзии должен уметь работать с очень тонким материалом, отражающим всю сложность и уникальность человеческого сознания, и именно этот факт затрудняет передачу поэтической информации читателю. В частности, в статье говорится, что эта трудность не делает невозможным поэтический перевод.

Также в статье поэтический перевод рассматривается как особый вид художественного творчества.

**Verdiyeva Elnurə Müqayis qızı**
Bakı Slavyan Universiteti
eli-1986@mail.ru

# CƏLİL MƏMMƏDQULUZADƏNİN "ANAMIN KİTABI" ƏSƏRİNDƏ "ANA" KONSEPTİNİN ƏSASLARI

***Açar sözlər:*** *"ana" konsepti, ana dili, milli-mədəni dəyərlər*
***Key words:*** *concept "mother", native language, national and cultural values*
***Ключевые слова:*** *концепт «мать», родной язык, национально-культурные ценности*

Cəlil Məmmədquluzadənin 1920-ci ildə yazdığı "Anamın kitabı" pyesini ədəbiyyat tədqiqatçılarının bir çoxu XX əsrin əvvəllərindəki Azərbaycanın güzgüsü hesab edirlər. Pyesin qəhrəmanları olan üç qardaş sanki o dövr Azərbaycan ziyalılarının ümumiləşdirilmiş xarakterləridir. Qardaşlardan böyüyü Rüstəm bəy Rusiyada, ortancılı Mirzə Məhəmmədəli İranda, kiçiyi Səməd Vahid isə Osmanlıda təhsil almış, bunun təsiri ilə öz danışıqlarını, davranışlarını dəyişmiş ziyalılardır. Bu mənzərənin ən gözəl təsvirini Mirzə Cəlil pyesin dördüncü səhnəsində, qardaşların onların kitabxanalarını təftiş etməyə, hökumət əleyhinə hər hansısa bir fəaliyyətlərinin olub-olmadığını yoxlamağa gələn senzor ilə söhbətinin lap başlanğıcında vermişdir. Senzor qardaşlardan özlərini təqdim etməyi istəyərkən onların cavabı belə olur:

*Rüstəm bəy: Rüstəm bəy Əbdüləzimof.*

*Mirzə Məhəmmədəli: Mirzə Məhəmmədəli xələfi mərhum Ağa Əbdüləzim.*

*Səməd Vahid: Əbdüləzimzadeyi Səməd Vahid.*

XX əsrin əvvəllərində Rusiya, İran və Osmanlı təhsilinin, mədəniyyətinin təsiri altında çox sayda belə ziyalımız yetişmişdi. Bu təsiri onların fəaliyyətində, yaradıcılığında, yazdığı şeirlərdə, hekayələrdə də görmək mümkündür. Tarixən Azərbaycanın qonşuluğundakı bu üç böyük imperiya ilə münasibətləri, bəzən onlardan birinin, bəzən digərinin ərazilərinə qatılması bizim ziyalıların şüurunda təsirsiz ötüşməyə bilməzdi. Əslində bu təsir özünü bu gün də göstərməkdədir. Fərq təkcə ziyalılarımızın bu ölkələrdə təhsil aldıqları darülfünun, mədrəsə və dərsxanələrin indi universitet adlandırılmasıdır. "Anamın kitabı" Azərbaycan ziyalısının bu vəziyyətini özündə əks etdirən şah əsərdir.

Pyesdə hər kəsi ortaq məxrəcə gətirməyə çalışan, küsənləri barışdırmağa, dava edənləri sakitləşdirməyə cəhd edən obraz Zəhra bəyim obrazıdır. Zəhra bəyim fikirləri heç vaxt üst-üstə düşməyən, hər zaman öz mövqeyini müdafiə edib digərinin mövqeyini gözardı etməyə çalışan bu qardaşların anasıdır. Əslində, pyesdəki "ana" konsepti, digər çoxsaylı ədəbi əsərlərdəki "ana" konseptlərindən o qədər də fərqlənmir. Pyesdə bizim qarşımıza qayğıkeş, övladını düşünən, onun yaxşılığını istəyən, bunun üçün özünü fəda etməyə hazır olan ana obrazı dayanır. Zəhra bəyim ana üçün ən böyük problem onun övladlarının bir-birindən ayrı düşməsidir. Üçüncü pərdədə ortancıl qardaş Mirzə Məhəmmədəli və kiçik qardaş Səməd Vahid kitablarını yığışdırıb evdən köçməyə hazırlaşan vaxt analarının qopardığı fəryad pyesdəki "ana" konseptinin bəlkə də bütün mahiyyətini açıb ortaya çıxarır.

*Zəhra bəyim: Bala, bunu hara yığışdırırsan? (Mirzə Məhəmmədəli cavab vermir və kitablarını yığışdırır). Olmaz, olmaz! Deyəsən buradan köçmək istəyirsən? Qoymanam, qoymanam, özümü öldürrəm! (Qoltuğunu eşələyir, bayazını çıxardır). Olmaz, köçmək olmaz! Siz burda hamınız bir yerdə yazılmısınız, ayrıla bilməzsiniz; yoxsa vallah bağrım çatlar! (Üzünü çöndərir Rüstəm bəyə). Rüstəm bala, qoyma getsin. Burada hamınız bir yerdə yazılmısınız, qoymanam ayrılasınız.*

Zəhra bəyim obrazı bir növ "Ana bala ucundan canını oda yaxar" (1, 71) atalar sözündəki "ana" konseptinin bariz nümunəsidir. Ana ortancıl oğlu Mirzə Məhəmmədəliyə dediyi sözlərə bənzər sözləri kiçik oğlu Səməd Vahidə də ünvanlayır.

*Zəhra bəyim: (Səməd Vahidə). Səməd, bala, sən nə qayırırsan? Niyə bunları yığışdırırsan? Yoxsa sən də köçmək istəyirsən? Buy, evim yıxıldı! Aman allah, mənim başıma kül ələnsin! Allah, məni öldür, öldür, öldür! (Ağlaya-ağlaya girir içəri).*

Yenə eyni qayğıkeşlik, övladı üçün keçirdiyi həyəcan, övladını qardaşlarından ayrı düşməyə qoymamaq istəyi. Yuxarıda da qeyd etdiyimiz kimi, bütün bunlar bədii əsərlərdə rast gəldiyimiz "ana" konseptlərinin hamısının demək olar ki, ümumi xüsusiyyətləridir. Bəs "Anamın kitabı" pyesindəki "ana" konseptini digər bədii əsərlərdəki oxşar konseptlərdən fərqləndirən cəhət nədir?

Mirzə Cəlil böyük ustalıqla tamam fərqli konseptlər olan "ana" və "vətən" konseptlərini sanki bir "ana" konseptinin içinə sığışdıra bilib. Fərqli ölkələrdə təhsil alıb vətənə dönən, aldıqları təhsilin təsiri ilə bir-birlərindən "qopmuş", mənən və ruhən ayrılmış vətən övladları. Onlar artıq bir-birini anlamırlar, sözün

birbaşa mənasında başa düşmürlər, biri rus, biri fars dilində, biri Anadolu türkcəsində danışır. Yazıçı ananın vasitəsilə əslində, vətənin dili olardısa bu zayalılara demək istədiklərini, deyə biləcəklərini çatdırır.

Pyesin ikinci pərdəsində Rüstəm bəyin otağında hər üç qardaşın üzv olduğu xeyriyyə cəmiyyətinin toplantısı keçirilir. Diqqətlə baxarsaq, bu xeyriyyə cəmiyyətinin o vaxtkı Azərbaycan cəmiyyətinin xırda maketi olduğunu görərik. Bir-birini anlaya bilməyən insanlar bir təşkilatı və nəhayətdə bir ölkəni necə idarə edə bilərlər? Xeyriyyə cəmiyyətinin toplantısındakı nitqlərə diqqət etmək kifayətdir ki, bütün bu fikir ayrılıqlarının mənbəyi ortaya çıxsın.

Rusiyada təhsil almış böyük qardaş Rüstəm bəyin çıxışından:

*Rüstəm bəy: Həzərat, il hesabı barəsində keçən zasedaniyada bir qədər raznoreçiya oldu... Zakon bu sluçayları tamamən predusmatret eləyibdir. Əgər raznoreçiye elə bir sluçayda oldu ki, onu mədaxil cərgəsində olan punktlar düz gətirmədi, o vədə smetni statyaları o qədər sokratit edirlər ki, il axırında hesab düz gəlir.*

İranda təhsil almış ortancıl qardaş Mirzə Məhəmmədəlinin çıxışından:

*Mirzə Məhəmmədəli: Əhval ki, kövkəblərə ariz ola, haman övzada ki, bir-birinə nisbətləri var, əz on cümlə haman əhvaldır ki, qəmər şəmsə ariz ola və bir surətdə ki, qəmər bir kəsif cinsdir və afitabdan kəsbi-nur eləyir və çün...*

İstanbulda təhsil alan kiçik qardaş Səməd Vahidin yaxın dostu Hüseyn Şahidin dedikləri:

*Hüseyn Şahid: Möhtərəm əzayi-əncümən həzrətlərinə öz ixlasımı təqdim edib, mətləbin ən ibtidasından bir şəmmə izahat verməyi fərz və qərz bilib, iltimas ediyorum, əfəndim. Arkadaşlar, şimdi həpimiz tanrımızın buyruğu ilə iştə göyümüzdə torpağa borcunu ödəməkdən qaçacaq tək bir kişi olmaz; onu hay cift sürərkən tər olaraq əlimizdən dökmüşüz, yetər!...*

Pyesin bir başqa qəhrəmanı üç qardaşın tək bacısı Gülbahardır. Gülbahar həmişə anasının yanındadır, anası ilə eyni xasiyyətdədir, qardaşlarının hamısını sevir, onların bir-birindən ayrı düşməsini istəmir. Qaradaşlarının analarına münasibəti də Gülbaharı narahat edir. Bu münasibəti isə aşağıdakı nümunələrdə bariz şəkildə görmək olar:

*1. Mirzə Məhəmmədəli: Ana, sən allah, sən də əl götür bizdən!*

*2. Rüstəm bəy (acıqlı). Eh, ana, sən allah, əl çək!*

*3. İçəri qapıdan Zəhra bəyim görsənir.*

*Rüstəm bəy və Mirzə Məhəmmədəli (ikisi də əllərini qalxızıb birdən): Ana, dayan, hələ gəlmə, söz danışırıq.*

*Zəhra bəyim yox olur.*

Zəhra bəyimin övladlarına münasibəti haqqında isə elə təkcə aşağıdakı bir cümlə hər şeyi deyir:

*Zəhra bəyim: Sizə gələn qada-bala mənə gəlsin, ay balalarım, savaşmayın!*

Əslində, ana ilə övlad arasındakı buna bənzər dialoqlara, münasibətlərə digər ölkələrin yazarlarının əsərlərində də çox rast gəlinir. Məsələn, məşhur rus yazıçısı Leonid Andreyevin “Yeddi məhbusun hekayəsi” povestində əsərin qəhrəmanlarından biri olan və nazirə sui-qəsd hazırladığına görə həbsxanaya salınaraq haqqında çıxarılan ölüm hökmünün icrasını gözləyən Vasili Kaşirin ilə ona son dəfə baş çəkməyə gələn anası arasındakı dialoq “Anamın kitabı”ndakı ana-oğul münasibətlərini çox xatırladır:

*- Anacan, gərək heç gəlməyəydin. İndi həm özünü üzəcəksən, həm də məni.*

*- Belə niyə deyirsən, Vasya?! Axı niyə belə elədin?! Tanrım!*

*Qarı göz yaşlarını qara yun dəsmalının ucu ilə silə-silə ağlayırdı. O da, qardaşları da cahil analarının üstünə qışqırmağa adət elədirklərindən Vasili dayanıb əsə-əsə hirslə dedi:*

*- Bilirdim! Bilirdim ki, elə belə də olacaq! Sən axı heç nə anlamırsan, anacan! Heç nə!* (2, 250)

Qeyd etmək gərəkdir ki, rus ədəbiyyatında ana-övlad arasındakı buna bənzər münasibətlərə tez-tez rast gəlinsə də, Azərbaycan ədəbiyyatı üçün “Anamın kitabı”ndakı ana-övlad münasibətləri o dövr nəsrimiz üçün yeni bir şey idi. “Ana haqqı – Tanrı haqqı” (3, 1012) – Azərbaycan mental düşüncəsində anaya münasibəti formalaşdıran doqmalardan biri bu atalar məsəlimizdə öz aydın əksini tapıb. Amma Mirzə Cəlilin “Anamın kitabı”nın qəhrəmanı olan üç qardaş məhz öz köklərindən uzaq düşmüş, mental özəlliklərini itirmiş xarakterlərdir. “...Qardaşlar arasında yad mədəniyyətin təsiri o qədər güclüdür ki, onlar bir yerə gələ bilmir, bir-birindən küsüb hərəsi bir tərəfə gedir. Burada söhbət hansısa obrazın dilindəki alınmalardan və məişət zəminindəki hansısa qarşıdurmadan deyil, onların əqidəcə milli ruhdan və onun məğzində dayanan ana dilindən uzaq düşməsindədir” (4, 43).

Pyesin süjet xəttinin kuliminasiya nöqtəsi dördüncü pərdədir. Bu pərdədə ananın əlində gəzdirdiyi, qardaşlar savaşarkən həmişə onlara tərəf uzatdığı kitabın sirri açılır:

*Zəhra bəyim: Qızım, bu kitabı al saxla yanında. Qardaşların yola getməyəndə kitabın bir yerində atanın yazısı var, - öz əlinən yazıb, - onu axtar tap, ver qardaşların oxusun. Onu oxusalar, daxı*

*savaşmazlar…*

Bəs görəsən bu kitabda – "Anamın kitabı"nda nə yazılıb ki, o savaşan qardaşları barışdırmağa qadirdir? Kitabda onların ataları dörd övladının doğulduğu, Zəhra bəyim ananın "canından dörd parçanın qopduğu" tarixləri qeyd edir və ən sonda yazır:

*Mən etiqad edirəm ki, mənim balalarım dünyada hər yanı gəzib dolansalar, genə əvvəl-axır anaları Zəhranın ətrafında gərək dolanalar; çünki ay və ulduz şəmsin parçaları olan kimi, bunlar da analarının ayı və ulduzlarıdır. Vay o kəsin halına ki, təbiətin həmin qanununu pozmaq istəyə! Onun insafı və vicdanı ona müdamül-həyat əziyyət edəcək, nə qədər canında nəfəs var, peşiman olacaq.*

Amma qardaşlar bu həqiqəti çox gec başa düşürlər. Gülbahar atasının yazdıqlarını oxuyub bitirəndən sonra həm Rüstəm bəy, həm Mirzə Məhəmmədəli, həm də Səməd Vahid analarına tərəf atılırlar. Ancaq analarını əlləri soyumuş və can üstə görürlər. Mirzə Məhəmmədəli anasının başının üstündə dayanıb fatihə surəsini oxumağa başlayır. Beləcə sağ ikən öz övladlarını bir yerə gətirməyi bacarmayan ana, ölümü ilə buna nail olmuş olur.

**Ədəbiyyat:**

1. Atalar sözü. (İkinci nəşri). Toplayanı, tərtib edəni və nəşrə hazırlayanı Əbülqasım Hüseynzadə. Bakı: Yazıçı, 1982, səh. 336 səh.

2. Leonid Andreyev. Uçuş. Bakı: Azərbaycan Tərcümə Mərkəzi, 2017, 320 səh.

3. Atalar sözü – ağlın gözü. Bakı: Elm, 2012, 1216 səh.

4. N.H.Hacıyeva. C.Məmmədquluzadənin müstəqillik dövrü ədəbi yaradıcılığında dil məsələləri. Bakı Universitetinin xəbərləri. Humanitar elmlər seriyası. N-2, 2011, səh. 40-46.

**Basics of the concept of "mother" in "My mother's book" by Jalil Mammadguluzadeh**
**Summary**

The article is dedicated to the analysis of the concept of "mother" in Jalil Mammadguluzadeh's play "My mother's book". "Mother" concept is included to the research from different angles – in the frame of various aspects, such as mother-child relationships, national language, uniqueness of national mind, exploring the impact of different cultures on our national culture. Besides this, by giving examples common features of the character of "mother" in "My mother's book" with similar characters from different national literatures are revealed.

Additionally, literary devices constituting the core of the concept of "mother", dragging it to the center of the book, attracting reader's attention are discussed.

**Основы концепта «мать» в произведении Джалила Мамедкулизаде «Книга моей матери»**
**Резюме**

Статья посвящена исследованию концепта «мать» в пьесе Джалила Мамедкулизаде «Книга моей матери». Концепт «мать» исследуется с различных ракурсах, таких как влияния отношений матери и ребенка, национального языка, своеобразия национального мышления, различных культур на нашу национальную культуру. Кроме того, на основе примеров выявляются общие сходства образа «матери» в пьесе «Книга моей матери», с аналогичными образами в других национальных литератур.

В статье также рассматриваются художественные приемы, которые составляют основу концепта «мать», ставят его в центр произведения и концентрируют на нем внимание читателя.

**Rəyçi: f.f.d. N.R.Vəli**

**Zhanat Askerbekkızı Aimukhambet**
L.N. Gumilev Avrasya Milli Üniversitesi
**Bazar Anaskızı Rakhmetova**
I.Altınsarin Arkalık Pedagoji Enstitüsü

# KAZAK FOLKLORU VE EDEBİYATINDAKİ DEDE KORKUT VE MİTOPOETİK ALAN

***Anahtar Kelimeler:*** *Dede Korkut, folklor, edebiyat, mitopoetik alan, mitik düşünce, motif, eski dünya görüşü, intertekst, ansıtma*
***Key words:*** *Dede Korkut, the folklore,the literature,the mitopoetic area, the mythic thought,the motif,the old worldview, the intertext,the reminiscence*
***Ключевые слова:*** *Дед Коркут, фольклор, литература, мифопоэтический аспект, мистическое мышление, мотив, древнее мировоззрение, интертекст*

Bütün Türk dünyasında ayrıca Kazaklar arasında adı ezelden beri bilinen meşhur Dede Korkut – büyük şair, usta besteci, ileri görüşlü, bakşılar piri, hanlar kılavuzu, halk arasında söylenen atasözlerinin sahibi, kısaca ifade etmek gerekirse arketiptik bir şahıstır. Dede Korkut'a ait hikayelerin hepsinde sır dolu olaylardan söz edilir. Onun dünyaya gelişi, başından geçen vakıalar, kopuz çalıcılığına kadar hepsi "mitik düşünce" etrafında tanıtılır. Kazak folklorunda Dede Korkut'un dünyaya gelişi ve dünyadan göçüşü su dünyasıyla ilgili gösterilecek olursa kopuzu – ruhun acayip olanaklara sahip olduğunu kanıtlayan bir alettir. Dede Korkut'un ölümden kaçış motifinin gizli bir anlamı var. Dede Korkut adıyla ilgili olarak söylenen "Kayda barsañ – Korkıttıñ köri (Nereye gitsen – Dede Korkut'un mezarı)", "Korkıtka jakkan şıraktay (Dede Korkut için yakılan çıra gibi)", vb. atasözleri ve deyimlerin folklorik-mitolojik yönü eski dünya görüşünden haber verir. Dede Korkut kaderiyle, hayatın kanunu ve zıtlıkların "birikmesi" işaret edilir. Dede Korkut, halk edebiyatı bir yana bırakılırsa yazılı edebiyatın da kahramanıdır. Edebi eserlerde de Dede Korkut motifleri esas alınmıştır. Makalede bu yöntem esasındaki görüşlere yer verilecektir.

Türk dünyasının mitik-efsanevi alandaki meşhur şahsı Dede Korkut Kazaklar arasında evliya, bakşıların piri, usta besteci, ebedi ömrü arayan kimse olarak bilinir.

Dede Korkut hakkındaki efsaneler neredeyse mitik bakış açısından da değerlendirilir. İlk motifler Dede Korkut'un dünyaya gelişi hakkında olsa da sonrakileri onun ebedi ömrü arayışıyla ilişkilendirilir.

Kazak sahasındaki Dede Korkut "izleri" küy (ezgi) dünyası ve bakşılık aleminde görülür. Yazılı edebiyattaki yeri göçebeler için ikinci sıradadır. Başka kahramanlara göre Dede Korkut'un folklor ve edebiyattaki şahsiyetinin ayırıcı yönünün başlaması çok eskiye dayanır. Bunun kanıtı – efsanelerle birlikte bu güne ulaşan "Dede Korkut Kitabı"dır.

Kazak folklorundaki Dede Korkut'un dünyaya geliş motifi – çok eski efsanelerde yer alır. Bu efsanelerde onun dünyaya gelişi sırlı bir güçle ilişkilendirilir. Yani mitolojik düşünceyle ilgili görülür.

Benzersiz yaratılışı, yani acayip bir şekilde dünyaya geliş motifi sonraki zamanlardaki masallarla destanlara da girer. "Er Töstik" masalındaki Töstik'in, "Alpamıs Batır", "Qobılandı Batır" destanlarındaki kahramanların dünyaya gelişi eski hikayedeki Dede Korkut'un doğuşu vakıasıyla benzeşir. Fakat, Dede Korkut'un dünyaya gelişi onlardan daha farklıdır:

| | |
|---|---|
| Korkıt tugan kezinde – | Korkut doğduğu sırada |
| Kara jerdi suw algan | Yeryüzünü su almış |
| Kara aspandı buw algan. | Gökyüzünü duman almış. |
| Ol tuwarda el korkıp, | Doğacakken halk korkup, |
| Tuwgan soñ äbden kuwangan | Doğduktan sonra sevinmiş. |

Bu satırlar bizim aklımıza "Tufan" vakıasını getirir. Yaygın olarak bilinen kozmolojik mitlerde su taşkını ve ondan kurtuluş yollarına ayrıca yer verilir. Araştırmacılara göre tufan olayı hakkında ilk olarak "Gılgamış Destanı"nda bahsedilir, bu olaya başka kutsal kitaplarda da yer verilir. Buradaki mitin bir bölüğü tamamıyla Tufan olayına ayrılmıştır. Sümer mitolojisinde dünyayı eskiden kocaman bir su kütlesinin kapladığı bildiriliyor. O okyanusun padişahı – tanrıça Tiyamat adlı çok korkunç bir yaratıkmış. Onu yenip, dünyayı düzene sokmak için savaş meydanına Marduk çıkar. Marduk, Tiyamatı yener ve onun bedenini ikiye böldükten sonra üst kısmından gökyüzünü alt kısmından da yeri yaratır [2].

Çin mitolojisinde su taşkınıyla gökyüzü ruhları, dağlar, alplerle kahramanlar mücadele ederler. Su taşkınıyla mücadele etmek için padişah Çjawn-syüy'ün oğlu Gün yola çıkar. Fakat o su taşkınına engel olamaz. O öldükten sonra, onun ölmüş bedeninden Yuy doğar ve su taşkınını yenen o olur. Çin mitindeki

Tufan – tanrının kargışıyla karşılaşmak, insanlara gönderilen sınav, onunla mücadele edip yenmek – yeryüzü hayatının galibiyete ulaşmasıdır. [3, 110-112].

Kazak mitolojisinde dünyayı su bastığında Nuh peygamberin insanoğlunu Allah'ın emriyle kurtarmış olduğu, Nuh'un bindiği geminin Kazıgurt dağına konduğu beyan edilir. Kazıgurt, mitolojik görüşte ayrıca yer alan ve Türk dünyasının ruhani uygarlıklarının birleştiği kutsal bir mekandır. Kazak mitlerinde, geminin Kazıgurt'un başına konup yeni hayatın başladığı konusundan ayrıca söz edilir.

Bu anlatılanlardan biz mitopoetik alanda su dünyasının ayrı bir yeri olduğunu görürüz. Eski dünya görüşünde su dünyasının şehitler hükümdarlığıyla ilgili olduğu görülür. Bizim yoğunlaşmamız gereken yer – Dede Korkut'un dünyaya geliş anında bu su dünyasının öne çıkmış olmasıdır. Gökyüzünü duman, yeri su kapladığı zamanda Dede Korkut'un dünyaya gelişi acayip sırlarla doludur. Bu Türk mitolojisindeki "küçük tufan" olayıdır. Yani böyle bir durumda dünyaya gelen Dede Korkut sıradan bir insan değildir. Eski efsaneleri araştıran Kazak bilim adamı Alkey Margulan şöyle diyor:

Sirderya'nın aşağı kısmında yaşayan Dede Korkut'un tarihi mekanını Kazaklar "Suv ayağı Qorqıt" (bazen -su ayağı qurdım-) diye adlandırmışlar. Kırgız şiirlerinde de böyle ifade ediliyor. Bakşının şiirinde de şöyle bir kısım var:

| | |
|---|---|
| «Suw ayagı Korkıt, | "Su ayağı Korkut |
| Päleketti sen korkıt!» [1, 152] | Felaketi sen korkut!" |

Mitik görüşe göre su – iki dünyayı birbirine bağlayıcıdır. Ömürle ölüm çekişmesi konusunda su önemli bir şekilde göz önünde tutulur. O zaman Korkut da o dünyayla bu dünya arasında yaşayan seçkin bir candır. Öyle olduğu için de Kazaklar arasında:

| | |
|---|---|
| Öli desem öli emes, | "Ölü desem ölü değil |
| Tiri desem tiri emes, | Diri desem diri değil |
| Sol atanaıñ atası – | O ataların atası- |
| Ertede ötken Korkıt ata, - | Ezelden beri Korkut ata" |

diye söylenir.

Dede Korkut'un üç yıl anasının rahminde yattığı söylenir. Burada folklorik büyüme denen görüşe rastlasak da "ana rahminde yatılan üç yılın" sembolik anlamına önem vermek gerekir. Dünyanın dik şeklini "üçlü" sıfatta tanımlamak dünya halkları mitolojisinde yaygındır. Gökyüzü alemi, yeryüzü alemi ve yeraltı alemi – Dede Korkut için tüm sırlarını açmış bir alandır.

Dede Korkut hakkındaki mitik efsane ve hikayeler ağızdan ağıza ulaşıp, medeni hatıramızda sağlam bir yer aldı. Dede Korkut'a saygı göstermenin örneği olarak halk ağzında bugüne kadar söylenen "Qorquta jaqqan şıraqktay" deyimini gösterebiliriz. Efsane boyunca, Dede Korkut'un mezarının başında hep çıra yanıp durexcluded durmuş ve Dede Korkut'un mezarından hep kopuzun sesi (küy sesi) gelirmiş derler. "Qayda barsan – Qorkıttın köri" denen bir atasözü de var. Buradan atalarımızın Dede Korkut'u akıldan çıkarmadan onu hep akıllarında tuttuklarını anlayabiliriz.

Kazak medeni görüşünde Dede Korkut şahsiyeti "mitik-folklorik" Korkut'tan "edebi" Korkut'a kadar ulaştı. Dede Korkut'un görkemini yansıtan edebi eserlerin birisi, elbette, "Dede Korkut Kitabı"dır. Oğuz-Kıpçak devrinin edebi eseri olarak tanınan bu eserde Dede Korkut; hanın kılavuzu, danışmanı, büyük şair, halkın birliği yolunda mücadele eden bir kahramandır.

Kazakların büyük şairi Mağcan Jumabayulı'nın "Qorqut" poemi "Şolpan" dergisinin 1922 yılındaki 2 ve 3 numaraları sayılarında yayımlanmıştır. Poem konusu olarak halk ağzında söylenen Dede Korkut hakkındaki efsaneler esas alınmıştır. Türk dünyasının acayip bir şahsiyeti olan Dede Korkut'u Mağcan Altay Dağı'yla ilgili görmüştür. Şair, hayatın geçici olduğuna üzülen Dede Korkut'un "Altay dağlarında tek başına gezmiş" olduğunu ifade eder [4,155]. Böylece Mağcan, Dede Korkut'tan yola çıkarak kendi durumunu anlatır.

Yazar Ravşanbek Bektibayev "Qayta oralğan Qorqut ata" (Yine dönmüş Dede Korkut) ilmî-fantastik romanında eski zamandaki Dede Korkut şahsiyetiyle çağdaş zamandakini birleştiriyor. Eserin başlangıcında yazar şöyle diyor: "Bizim bildiğimize göre Korkut (Hor-Hut) dediğimiz – gökyüzünden, güneşten yaratılan büyük Tanrı, hanlarla padişahları destekleyip, hayat gücünü verici kutsal "kut"tur. Bununla birlikte Dede Korkut – yer altı aleminin sahibidir. Hatta yağış olaylarını düzenleyen, nehirleri ters akıtan, Gök Tanrıyla haberleşen bu – Dede Korkut'tur. Bununla birlikte Macaristan'daki Kıpçak boyları "Korkut" sözünü "ulu" sözüyle bağdaştırıyor [5, 84]. Mitik görüşteki Dede Korkut'un "iki dünyayı birleştiricilik hizmeti" R.Bektibayev'in yeni fantastik hikayesinin ortaya çıkmasını sağladı. Bu roman 1998 yılında Türk diline çevrildi.

Günümüz şairlerinden İran-Gayıp'ın "Dede Korkut'un mezarı" [6, 3-25] adlı destanı halk ağzında yayılmıştır. Bu destan eski mitik süjeye göre yapıldı. Yani tüm dramalık poemaya Dede Korkut hakkındaki

süje esas olmuştur.

"Hazır süjeyi" kullanmak – teorisyenlerin dediğine göre "sinkretizm devrine" aittir. "Bu devirde iki hadiselik arketip – görkemli gelişmenin sıralı derecesi olarak hazır süjeyi dilin verilmesinin kümülatifi ve tsiykıllı türü göründü [7; 169]. Eydetik poetikada "süje eserciliği durup, şimdi onu kullanım başladı" der O. M. Freydenberg [8; 322]. Bu araştırmacının kümülatifi ve tsiykıllı şemayı biriktirip, "mitolojik syüjet" anlayışında araştırdığı bilinmektedir.

Eski devir edebiyatını araştıran bilim adamı A. Qıravbayqızı: "Hayat ve ölüm konusu insanoğlu medeniyetinin en eski ve en kıymetli bilgileri veren "Gılgamış" ve "Avesta" yazmalarında da var. [9; 39] "Gılgamış da Dede Korkut gibi ölümden kurtulmak için onunla mücadele eder, "Dede Korkut efsanesindeki ölümden kaçma ideası –Dede Korkut kitabındaki- Deli Dumrul hakkındaki hikayede görülür" [9; 40], - diye yazar. Halk ağzındaki Dede Korkut'un ölümden kaçma motifi Dede Korkut kitabındaki "Dumrul'un kızıl kanatlı Azrail'le savaşması" hikayesiyle bağdaştırılıp bu "hazır süjeler" esasında şair İran Gayıp "Dede Korkutun Mezarı" destanını yazmıştır.

"Dede Korkut'un Mezarı" efsane-destanının kahramanları – bütün Türk dünyasının kutsal hafızı, piri Dede Korkut ve Canalıcı-K, dede Korkut'un babası – Karahoca-Oğuz ata, anası – Kamka-Kıpçak ana, yönetici-bey – Kahan, Dede Korkut'un eşi – Sarın aruv, arkadaşı Päpil ve metresi-Nike'dir. Bunlardan başka destan hadisesi her türlü Sesler ve Kırk kız motifleriyle bağdaştırılır. Hadisenin geçtiği vakit – "Peygamber zamanına yakın zaman (VII-VIII. asır), geçtiği yer – "Bayat (Sirderya Nehri) yakası"dır (Destanın girişinde verilen bilgiler böyle).

Bu drama destanına göz gezdirildiğinde ilk önce – hadise içinde tanıdık, halkın hatırasında saklanan efsanelerin motiflerinden alındığını anlarız. İran Gayıp efsane hadisesini eserin esasına alıp, kendisinin yazarlık hayaline uygun olarak görkemli poetik katkılar ilave etmiş. Dede Korkut hakkındaki efsanelerin içinde en ünlüsü – Dede Korkut'un ecelden kaçması ve kopuzunu yapıp onunla dertli ve yüksek sesli bir küy çalmasıdır.

Destan içinde, zamanına darılan Dede Korkut gökyüzü sahibine - Tanrısına derdini anlatır. Bu görünüş "gökyüzü altı… yer üstü… bozkır… tabiat" çevresinde geçer. Tanrıyla konuşmak için gökyüzüne ulaşmaya çalışan Dede Korkut üzüntüsünde bütün insanoğlunun büyük derdini üstlenmiş gibidir.

| | |
|---|---|
| … Kem tüysinip, az ugam: | … Eksik düşünüp az anlıyorum |
| Mümkin seniñ bazınañ… | Belki senin isteğinden… |
| Beyne nahak nalasınday | Belki boş üzüntüsü gibi alemin |
| Jatırında | Rahminde |
| Üş jıl jattım Anamnıñ! | Üç yıl yattım anamın |
| Äwel basta-ak | İlk başta |
| Magan kiymadıñ | Bana kıymadın |
| Togız ay | Dokuz ay |
| Tofız künşilik | Dokuz günlük |
| Şarana-Gumırın Adamnıñ - | Bebek ömrün adamın |

diye heyecanlanan Dede Korkut şiirlerinin esası ana rahminde üç yıl yattığı hakkındaki efsaneden başlar. Halk ağzındaki Dede Korkut'un doğumu sırasındaki efsane İran Gayıp destanında şöyle ifade edilir:

| | |
|---|---|
| Men kelerde – | Ben doğarken |
| Ay menen kün şagılısıp, | Ay ve güneş çarpışıp |
| Aruwana-tirşilik | Güzel hayat |
| Küyisinen jañılıp, | Durumundan yanılıp |
| Auwa kozdanıp- | Hava sinirlenip |
| Kara aspandı buw aldı | Kara gökyüzünü buhar aldı |
| Topırak bazdanıp - | Toprak bozulup- |
| Kara jerdi suw aldı. | Kara yeri su aldı. |
| Eki ayaktı jumır bastınıñ– | İki ayaklı yuvarlak başlının |
| Zäre-kutın uşırıp, | Korkutup |
| Salıp tuwdım landı ... | Doğdum felaketi çağırıp… |

Birinci görünüşteki Dede Korkut monoloğunda bulunduğu ortama sığmadan kaçıp, sadece tabiatı dost görüp, ona baş vuran ve Tanrıyla da konuşup yaratılışın sırrını öğrenmeye çalışan benzersiz adamın (Dede Korkut'un) heyecanı ve yürek derdi söz konusudur.

Yaratıcı Tanrıya şöyle der:

| | |
|---|---|
| Korkıttın kim ekenin | Korkut'un kim olduğunu |
| Jaratuwşı öziñ bolmasañ | Yaratıcı sen olmasan |

S.Avramovun digər bir qeydi Şah II Təhmasibin siyasi durumunu açıq şəkildə təhlil etməyə imkan verir. “Şah məğlub olub qovulduqdan sonra öz qullarağası (qulam hərbi dəstələrinin başçısı-Z.İ.) və ləşkərbaşını (feodal hərbi dəstəsinin başçısı) kömək istəmək üçün 40 min rubl pulla Barfuruşdan dənizlə türkmənlərin yanına göndərmişdi”. Fətəli xan Qacar şahın bu addımını eşidib, hiyləyə əl atır. “Boynunda qılınc və Quranla şahın hüzuruna gəlir”. Şahzadə Təhmasib onun təslim olmasına inanır və Astrabada gedir. Burada II Təhmasib şah elan edilsə də, dövlət faktiki olaraq qacarlar tərəfindən idarə edilirdi. S.Avramovun “şahı, əsir (məhbus) kimi gördüm...” sözləri bu faktı bir daha təsdiq edir [4, 90-91]. “Şah öz iradəsi ilə və ya əksinə, Fətəli xana vəkillik vermiş və bütün hakimiyyəti ona həvalə etmişdi” [4, 92]. Maraqlıdır ki, Qızılbaş şahı II Təhmasib hakimiyyətin bərpası üçün sığındığı bir şəxsin əsirinə çevrilmiş, hətta bütün hakimiyyəti ona təslim etmişdi. S.Avramovun qeydləri Səfəvilərin siyasi durumunu və mərkəzi hakimiyyətin acınacaqlı vəziyyətini bir daha sübut edir.

Beləliklə, Rusiyanın digər dövlət nümayəndələri kimi, Semyon Abramovun da tərtib etdiyi gündəlik və qeydlərin XVIII əsrin Azərbaycan tarixinin mürəkkəb səhifələrinin araşdırılmasında xüsusi çəkisi vardır. Semyon Abramovun fəaliyyətini bir diplomat və dövlət xadimi kimi təhlil etdikdə onun kifayət qədər bacarıqlı dövlət nümayəndəsi olduğunu görürük. Lakin, dövrün də mürəkkəbliyini və Rusiya diplomatiyasına qarşı dura biləcək siyasi qüvvələrin bu dövrdə Qızılbaş dövləti ilə birgə tənəzzül etdiyini unutmamalıyıq. Rusiya diplomatiyasının Cənubi Qafqazda XVIII əsrin ilk qərinəsində geniş əl-qol açmasına səbəb məhz Azərbaycan Səfəvi dövlətinin süqutu olmuşdur. Lakin rezidentin gündəliyindən əldə etdiyimiz materialları müqayisəli təhlillər üsulu vasitəsilə araşdırdıqda bu qeydlərin dövrün tarixi gerçəkliyinin əldə edilməsi üçün nə dərəcədə mühüm əhəmiyyət kəsb etdiyini açıq şəkildə görə bilərik.

### Ədəbiyyat:


1. William S. Haas: Iran. New York: Columbia University Press, 1946. pp. 273.
2. Абрамов С. Дневная записка бывшего в Персии у Шаха Тахмаспба Российского секреетаря Семена Аврамова. // www.vostlit.info
3. Мамедова Г.Н. Русские консулы об Азербайджане (20-60-е годы XVIII века). Баку, Элм, 1989, 128 с.
4. Миклухо-Маклай Н.Д. Записки С.Аврамова об Иране как исторический источник // Ученые записки ЛГУ, 1952, №128, 88-103с.
5. Семён Аврамов 1696 - 01.1735 http://www.rusdiplomats.narod.ru/avramov-s.html.
6. Уляницкий В.А. Русскія консульства за границею въ XVIII вѣкъ. Изслъдование В.А. Уляницкаго. Часть I. Москва: Типография Г.Лисснера и А.Гешеля, 1899, 1552 с.


### Russian consul S.Abramov's "notes"


**Symmary**

In the article has been submitted notes of S.Abramov about Azerbaijan history of XVIII century. The consul's diary is great vital for the history of Azerbaijan. "Notes" by Semyon Avramov, the representative of the Russian state in palace of Shah II Tahmasib (1722-1732), is very important for the study of the military-political situation of the Safavid state. S.Avramov included Safavid’s political and economic issues, occupation of Afghans, and etc. on his diary. S. Avramov, wrote his notes every day, without characterizing the events, and provided more accurate information than other sources.


### «Заметки» русского консула С.Абрамова


**Резюме**

В статье было изучено «заметки» С.Абрамова об истории Азербайджана XVIII века. Дневник консула важен для истории Азербайджана. «Записки» Семена Аврамова, представителя русского государства во дворце шаха II Тахмасиба (1722–1732), очень важны для изучения военно-политической обстановки государства Сефевидов. С.Аврамов включил политические и экономические вопросы Сефевидов, оккупацию афганцев и т.д. в свой дневник. С. Аврамов писал свои заметки каждый день, не охарактеризовав события и предоставляя более точную информацию, чем другие источники.


**Rəyçi: dos. M.Abdullayev**

**Qəribova Aysel Əkrəm qızı**
Bakı Dövlət Universiteti

# SƏFƏVİLƏRİN HERAT UĞRUNDA MÜBARİZƏSİ

***Açar sözlər:*** Səfəvilər, Xorasan, Herat, Əliqulu xan, qızılbaşlar, şamlular
***Key words:*** *Safavids, Khorasan, Herat, Aliqulu khan, khizilbashs, shamlus*
***Ключевые слова:*** *Сефевиды, Хорасан, Герат, Алигулу хан, кызылбаши, шамлу*

Azərbaycanın ən qüdrətli sülalələrindən olan Səfəvilərin Mərkəzi Asiya dövlətləri ilə münasibətlərinin araşdırılması zamanı bir sıra mühüm aktual məsələlər üzə çıxmışdır ki, onların tədqiqi mühüm əhəmiyyət kəsb edir. Müasir dövrdə Azərbaycan tarixinin qarşısında duran mühüm vəzifələrdən biri də Səfəvilərin qonşu dövlətləri ilə, əsasən də Mərkəzi Asiya ilə münasibətlərinin araşdırılmasıdır. Nəzərə almalıyıq ki, Səfəvilərin əsas rəqibləri olan Şeybanilər dövləti Mərkəzi Asiyanı əhatə edir və daim olaraq Səfəvilər ilə mübarizə aparırdı. Onu qeyd edək ki, Mərkəzi Asiyanın əsas bölgələrindən olan Herat uğrunda Səfəvi sülalə nümayəndələrinin apardığı siyasət böyük maraq doğurur. Əlbəttə ki, Azərbaycan tarix ədəbiyyatında Mərkəzi Asiya ilə olan münasibətlərə dair məlumatlara az da olsa rast gəlinir. Lakin bu Herat məsələsinin araşdırılması üçün kifayət deyil və yeni tədqiqat tələb edir. Araşdırılmanın əsas məqsədi Səfəvilərin Herata olan marağı və bu bölgənin Səfəvilər üçün strateji əhəmiyyətini aşkarlamaqdır. Səfəvi tarixinin tanınmış tədqiqatçılarından biri Ə.Rəhmanidir. Müəllif «Tarix-i aləm aray-i Abbasi Azərbaycan tarixinin mənbəyi kimi» adlı monoqrafiyasında Səfəvi-Mərkəzi Asiya əlaqələrinə müəyyən qədər yer ayırmışdır. Müəllif əsas etibarilə 1599-cu ildə Herat yaxınlığında Şah I Abbasın (1587-1629) Din Məhəmməd xan üzərində qələbəsinə toxunmuş, 1602-ci ildə Səfəvi qoşunlarının Bəlx yürüşünün uğursuzluğunun səbəblərini təhlil etmişdir [10, 93-94]. Təəssüflər olsun ki, Ə.Rəhmani öz monoqrafiyasında Səfəvi-Mərkəzi Asiya münasibətləri haqqında heç bir qeyd etməmişdir. Böyük tarixçimizin Səfəvi dövləti tarixinə həsr etdiyi digər monoqrafiyası "Azərbaycan XVI əsrin sonu və XVII əsrdə" adlanır. Müəllif bu əsərində də Mərkəzi Asiya ilə münasibətlərə az yer vermiş, ancaq 1599-cu il Herat savaşından sonra Şah Abbasın Mavərəünnəhrin daxili işlərinə müdaxilə etmək imkanı əldə etməsi, 1602-ci il Bəlx yürüşünün uğursuz olmasını göstərməklə kifayətlənmişdir [9, 63].

Tədqiqata cəlb etdiyimiz digər bir müəllif rus şərqşünası N.D.Mikluxo-Maklayın iki məqaləsini göstərmək olar. Müəllifin hər iki məqaləsi XVI əsrin I yarısında Səfəvi-Şeybani münasibətlərinə həsr olunmuş, onlar arasında qarşılıqlı əlaqələrin gərginləşməsində məzhəb ayrılığının roluna diqqət yönəldilmiş, həmçinin Übeydulla xanın basqınları dövrü və 1535-1536-cı illərdə baş vermiş Herat üsyanı haqqında məlumatlar verilmişdir [7; 8].

Səfəvi-Mərkəzi Asiya münasibətləri haqqında danışarkən V.V.Bartoldun araşdırma obyektinə çevrilən mövzunun öyrənilməsi baxımdan əhəmiyyət doğuran iki məqaləsini xüsusi olaraq qeyd etmək lazımdır. Müəllifin "İranın tarixi-coğrafi icmalı" adlı məqaləsində Səfəvi dövlətinin tərkibinə daxil olan vilayətlərin, o cümlədən Xorasanın Mərv, Herat, Məşhəd, Nişapur və s. kimi şəhərlərinin tarixi-coğrafi təsvirini vermiş, siyasi hüdudlarını, iri yaşayış məskənlərini göstərmiş, həmçinin bu vilayətlərdən keçən mühüm ticarət marşrutlarının əsas məntəqələrini şərh etmişdir [4]. Avropa şərqşünasları içərisində macar səyyahı və tarixçisi G.Vamberinin Buxara tarixinə həsr etdiyi monoqrafiyası böyük maraq doğurur. Müəllifin əsərində XVI əsrin 70-ci illəri – XVII əsrin sonuna qədər Buxara tarixi geniş şəkildə öz əksini tapmışdır. Əsərdə Abdulla xanın Herat və Məşhədi işğal etməsi, Xarəzm hakimi Hacı Məhəmməd xanın Səfəvi sarayı ilə münasibətləri, Şah Abbasın Xorasan uğrunda mübarizəsi, Həştərxanilər sülaləsinin mənşəyi, Şah Abbasın Bəlxə yürüşü, Buxara xanları Vəli Məhəmməd, İmamqulu, Nəzər Məhəmməd, Əbdüləziz və Sübhanqulu xanın dövründə Səfəvi-Həştərxani münasibətləri, həmçinin Böyük Moğol-Buxara və Buxara-Osmanlı diplomatik danışıqlarında Səfəvi məsələsi ilə bağlı maraqlı məlumatlar öz əksini tapmışdır [5, 47-99].

İki türk sülaləsi Səfəvilər ilə Şeybanilər arasında qarşılıqlı münasibətlər 1507-ci ildən başlamış və bütün XVI-XVII əsrlər boyu hərbi-siyasi qarşıdurma şəraitində davam etmişdi. İki dövlət arasında başlanmış qarşıdurmanın əsl səbəbi strateji əhəmiyyətli Xorasan uğrunda rəqabət idi. Bu ərazi coğrafi baxımdan çox mühüm mövqedə yerləşir və geniş əraziləri əhatə edən dörd böyük vilayəti - Bəlx, Mərv, Herat və Məşhədi əhatə edirdi. Səfəvi dövlətinin Hindistan və Mərkəzi Asiya ilə tranzit ticarət yollarının qovşağında yerləşən Xorasan geniş iqtisadi potensiala malik bir bölgə idi. Bu bölgədə hakimiyyət uğrunda XVI əsrin 80-ci illərində Xorasan (şamlı, ustaclı) və Azərbaycan (təkəli, türkman) qruplaşmaları arasında kəskin mübarizə gedirdi [9, 28]. Qızılbaş əmirləri arasında birlik olmadığından Səfəvi ordusu Osmanlılar ilə mücadilədə ciddi müqavimət göstərə bilmir, dövlətin mühüm vilayətləri bir-birinin ardınca işğal edilirdi. Belə bir vəziyyətdə

hakimiyyətə iddialı olan Xorasan qruplaşması mərkəzi hakimiyyətə itaət etməkdən tamamilə boyun qaçırdı. Xorasan qruplaşmasına Herat hakimi Əliqulu xan Şamlı və Məşhəd hakimi Mürşüdqulu xan Ustaclı başçılıq edirdilər. Məhəmməd Xudabəndənin (1578-1587) əmrilə Abbas Mirzənin lələsi təyin edilən Əliqulu xan Şamlı və Mürşüdqulu xan Ustaclı 1581-ci ildə Abbas Mirzəni şah elan edərək, Məhəmməd Xudabəndənin məmurlarının Xorasana daxil olmasının qarşısını aldılar [9, 28]. İqtisadi cəhətdən güclü olan vilayət hakimləri artıq mərkəzi hakimiyyətə iddia edir, saray çəkişmələrini yönləndirirdilər. Mənbələrin araşdırılması zamanı Herat hakimlərinin iqtisadi cəhətdən nə dərəcədə gücə malik olduğuna bir daha şahid oluruq.

Səfəvi şahı Məhəmməd Xudabəndənin hakimiyyətinin sonlarında Qəzvin sarayı siyasi böhran ilə üzləşir, bundan istifadə edən qızılbaş əmirlərinin mərkəzi hakimiyyət uğrunda mübarizəsi kəskinləşir. Əlbəttə ki, bu zaman Herat hakimlərinin başçılıq etdiyi Xorasan qruplaşması daha iddialı olub, siyasi oyunların əsas iştirakçıları idilər. Lakin onlar arasında parçalanma baş verdi. İsgəndər bəy Münşinin məlumatına əsasən, Herat hakimi Əliqulu xanla Məşhəd hakimi Mürşüdqulu xan arasında başlanmış münaqişə hərbi qarşıdurma ilə nəticələndi və 1585-ci ildə Turşizdə baş vermiş savaşda Mürşüdqulu xan qalib gələrək Abbas Mirzəni ələ keçirərək özünü onun vəkili və lələsi elan etdi [2, 549-555]. Gördüyümüz kimi, Herat qrupu Səfəvi dövlətində mərkəzi hakimiyyət uğrunda mübarizədə məğlub olur. Abdulla xan Xorasana yürüş təşkil edir və onu da qeyd edək ki, Xorasanın mərkəzi şəhəri Heratın ələ keçirilməsinin həm iqtisadi, həm də siyasi əhəmiyyəti vardır. Tədqiqatımızda üzləşdiyimiz mübahisəli məsələlərdən biri budur ki, Abdulla xanın Xorasanın paytaxtı Herata hücum tarixi ilə bağlı tarixi ədəbiyyatlarda müxtəlif fikirlərə rast gəlmək mümkündür. "Özbəkistan SSR-in tarixi" adlı kitabın I cildində belə məlumat verilir ki, Abdulla xan doqquz aylıq mühasirədən sonra Xorasanın paytaxtı Heratı ələ keçirdi [6, 407]. Bu məlumatdan belə bir nəticəyə gəlmək mümkündür ki, Abdulla xanın Xorasana yürüşü 1582-ci il və yaxud 1583-cü ilin əvvəllərində baş vermişdir. Oxşar fikrə Buxara tarixinə xüsusi tədqiqat işi həsr edən German Vamberinin əsərində də rast gəlinir. Müəllif yazır ki, Abbas öz rəqibi Məhəmməd Xudabəndə ilə mübarizə aparan zaman Abdulla xan doqquz aylıq mühasirədən sonra Herat qalasını ələ keçirdi və Xorasanın canişini Əliqulu xan Şamlını qətlə yetirdi [5, 47]. G.Vamberi bu hadisənin baş verdiyi tarixi göstərməsə də, az sonra qələmə aldığı hadisələr bunun nə vaxt baş verdiyinə müəyyən aydınlıq gətirir. Belə ki, müəllif Abdulla xanın 1582-ci ildə Məşhədi tutmaq üçün ikinci dəfə cəhd göstərdiyini və bu məqsədlə ordunun başına Bəlx canişini olan oğlu Əbdülmömini təyin etdiyini göstərir [5, 49]. Beləliklə də, Abdulla xanın Xorasana yürüşə başlamasını G.Vamberinin 1581 və yaxud 1582-ci ilin əvvəlinə aid etməsi aydınlaşır.

Bununla belə digər tədqiqatçıların araşdırmaları bu faktı təsdiq etmir. Böyük tarixçi R.Ağayevin fikrincə, Abdulla xanın Xorasana yürüşü 1587-ci ilin ikinci yarısında başlamış və Herat qalası 1588-ci ildə işğal edilmişdi [1, 119]. XVI əsrin sonunda Mərkəzi Asiya - Səfəvi münasibətlərinə xüsusi məqalə həsr etmiş D.Y.Arapov Abdulla xanın Herata yürüşünün 1587-ci ilin yayında başlandığını və Herat qalasının 1588-ci il fevralın 17-də fəth olunduğunu qeyd etmişdir [3, 73-74]. İran tarixçisi Nəsrullah Fəlsəfinin fikrinə görə, Abdulla xan 1587-1588-ci illərdə Xorasana hücum etmiş və on bir aylıq mühasirədən sonra Heratı ələ keçirmişdi [12, 1435].

Dövrün mənbələri, xüsusilə də bu hadisələrin müasiri olan İsgəndər bəy Münşi Abdulla xanın 1583-cü ildə Xorasana yürüş etməsi faktını təkzib edərək, bu yürüşün təfərrüatları haqqında daha ətraflı məlumat verir. İsgəndər bəyin məlumatına əsasən, 1584-1585-ci ildə Mürşüdqulu xan Ustaclı tərəfindən Turşizdə məğlub edildikdən sonra Herata qayıdan Əliqulu xan Şamlı öz rəqibinə qarşı müttəfiq qazanmaq üçün Qəndəhar mirzələri və Buxara hakimi Abdulla xanla yaxınlaşmağa və sonuncunu Xorasana yürüşə sövq etməyə başladı [2, 655]. Beləliklə, İsgəndər bəy Münşi də bu yürüşün 1587-1588-ci illərdə baş verdiyini təsdiq edir. Əliqulu xan Şamlı ilə Abdulla xan arasındakı əlaqələri araşdıran Nəsrullah Fəlsəfi qeyd edir ki, Mürşüdqulu xan Ustaclıdan intiqam almaq istəyən Əliqulu xan Şamlı öz elçisi Hacı bəy Bicilunu çoxlu hədiyyələrlə Abdulla xanın yanına göndərərək onu Xorasana yürüşə həvəsləndirməyə çalışmış, yürüşün baş tutacağı təqdirdə Herat qalasını dərhal ona təslim edəcəyinə, hətta İraq və Kirman vilayətlərinin zəbt edilməsində yardımçı olacağına söz vermişdi [12, 167]. Müəllifin məlumatına görə, Əliqulu xan Şamlı bir qədər sonra Buxaraya ikinci bir elçilik göndərir və Abdulla xandan Xorasana yürüşü sürətləndirməyi xahiş edir [12, 167]. Məhz bu hadisədən sonra Abdulla xan böyük bir ordu ilə 1587-1588-cu illərdə Herata yürüşə başlamışdı. Bu zaman Mürşüdqulu xan Ustaclı Şah Abbasla birlikdə Məşhəddən çıxaraq Əliqulu xanla münasibətləri nizamlamaq üçün Herata doğru getmək istəsə də, Qəzvindən həyəcanlı xəbərlər aldığına görə bu məqsədindən vaz keçərək on beş min nəfərlik qoşunla Qəzvinə getməyə məcbur olmuşdu [12, 168].

Qəzvin sarayında baş verən siyasi qarışıqlıqdan istifadə edən Abdulla xan öz elçisini Əliqulu xanın yanına göndərərək Heratda öz adına xütbə oxutmağı və sikkə zərb etməyi tələb etmiş, bunun müqabilində Mavərənnəhr və Türküstan viləyətlərinin birini ona verəcəyini vəd etmiş, əks təqdirdə Heratı tərk etməsini

tələb etmişdi [12, 168]. İsgəndər bəy Münşinin məlumatına görə, Abdulla xanın Xorasana yürüşü xəbərini eşitdikdən sonra Əliqulu xan öz əməlindən peşiman olaraq özbəklərin tabe olmaq təklifini rədd edərək, Herat qalasının müdafiəsini gücləndirməyə başlamışdı [2, 730].

İlkin mənbələrə əsasən dövrün diplomatik qanunlarını pozaraq Abdulla xan Əliqulu xanın elçisini topun lüləsinin ağzına bağlatdırıb qalaya doğru atdırdı. Bundan sonra Əliqulu xan daha iki ay qalanın müdafiəsini davam etdirə bilir. Lakin qüvvələrin tükənməsi, digər tərəfdən isə İsgəndər bəy Münşinin məlumatına əsasən, Herat qalasında olan Xorasanlıların, xüsusilə də Molla Mir Baxərzinin təhriki ilə şəhər bürclərindən birinin müdafiəsiz buraxılması Abdulla xanın Heratı tutmasına yardımcı oldu [2, 730-731]. Özbək qoşunlarının şəhərə doluşduğunu görən Əliqulu xan az qüvvə ilə şəhərin mərkəzində yerləşən İxtiyarəddin qalasına sığınaraq daha iki gün müdafiə olunsa da, müqavimətin mənasız olduğunu dərk edərək tabe oldu. Əliqulu xan və digər Şamlı tayfasının əyanları qətlə yetirildi, çoxlu sayda əsir alınanları isə Mavərənnəhrə apardılar [11, 53]. Xorasanın mərkəzi hesab edilən Heratın itirilməsi Səfəvi dövlətinin nüfuzuna ciddi zərbə vurmaqla yanaşı, regionun digər bölgələrinin də özbəklər tərəfindən işğal edilməsi prosesini sürətləndirmiş oldu.

Herat hadisələri baş verən zaman Mürşüdqulu xan Ustaclı Abbasın Qəzvində taxta çıxarılması ilə məşğul olduğuna görə, mərkəzi hakimiyyət müdafiəçilərə yardım göstərmək iqtidarına malik deyildi. Digər tərəfdən, onu da qeyd etmək lazımdır ki, Mürşüdqulu xan əslində Heratda baş verən hadisələri şahdan gizli saxlamağa çalışır, imkanı olsa da belə Heratın müdafiəçilərinə heç bir yardım göstərmirdi. Əliqulu xanın Heratın mühasirəsindən çıxacağı təqdirdə özünə əsas rəqiblərdən biri olacağını yaxşı dərk edən Mürşüdqulu xan həm də, Şah Abbasın öz lələsini dövlətin əsas dayaqlarından birinə çevirəcəyindən ehtiyatlanırdı.

Abdulla xanın 1587-1588-ci il yürüşünün əsas nəticəsi Herat şəhəri daxil olmaqla Herat vilayətinin fəth edilməsi oldu. Abdulla xan özünün yaxın silahdaşı, təcrübəli sərkərdə Qulbaba Kukəltaşı Herat hakimi təyin etdi. Heratın işğal edilməsi və lələsi Əliqulu xanın qətlə yetirilməsi xəbərini eşidən Şah Abbas böyük bir qoşunla Abdulla xana qarşı yürüşə başlayaraq Bəstam şəhərinə qədər gəldi. Şah Abbas burada Əliqulu xan Şamlının qətlinin əsas baiskarı Mürşüdqulu xan Ustaclı və tərəfdarlarını aradan götürsə də, yürüşü yarımçıq dayandırmağa məcbur oldu [2, 757-760.]. Nəsrullah Fəlsəfi yürüşün dayandırılmasının əsas səbəbinin Osmanlı qoşunlarının Azərbaycana hücumu, eləcə də Yəzd, Kirman və Fars vilayətlərində qızılbaş əmirlərinin separatizmi ilə bağlı olduğunu göstərmişdir [12, 1435]. Bu dövrün hadisələrini təsvir edən salnaməçi Molla Kamal yazır ki, bir müddət Əsfərayin çəmənliyində qaldıqdan sonra Şah Abbas qoşunu bir yerə toplamaq məqsədilə Məşhədə getdi. Bu zaman Fərhad xan və qardaşı Zülfüqar xan Qaramanlı öz qoşunları ilə Şirvandan gəlib Şahla birləşdilər. Şah Abbas Ümmət xanı Məşhəd hakmi təyin edib Herata doğru hərəkət etsə də, qış yaxınlaşdığına görə və Osmanlıların qərb torpaqlarına təcavüz etməsi və Ciqaloğlunun Həmədan və Nəhavəndə hücum etməsi xəbərini aldıqdan sonra Herat səfərini dayandırdı [11, 53].

Beləliklə, ilkin mənbələr əsasında Şah Məhəmməd Xudabəndə dövründə Herat uğrunda kəskin mübarizənin təfərrüatlarını izləmiş oluruq. Heratın iqtisadi cəhətdən əhəmiyyətli bir bölgə olması onun siyasi çəkisini artırmışdır. Bu zəmində Səfəvilərin Buxara və Şeybanilər ilə münasibətləri gərginləşmiş və Herat uğrunda mübarizə daha da kəskinləşmişdir. Səfəvilərin siyasi böhran içində olması qonşu dövlətlərə fürsət vermişdi, lakin Şah I Abbasın hakimiyyətə gəlişi ilə Heratın geri qaytarılmasına cəhd edilsə də, osmanlılar ilə mübarizə bu məsələnin yarımçıq saxlanmasına səbəb olmuşdu.

## Ədəbiyyat:

1. Ağayev R.Ə. Azərbaycan və Mərkəzi Asiya dövlətlərinin qarşılıqlı münasibətləri (XV-XVI əsrlər). Bakı: Kür, 2004, 151 s.
2. İsgəndər bəy Münşi. Dünyanı bəzəyən Abbasın tarixi. Fars dilindən çevirən prof. Şahin Fərzəliyev. Bakı: Şərq-Qərb, 2010, 1144 s.
3. Арапов Д.Ю. Из истории взаимоотношений Средней Азии и Ирана в конце века // Вестник Московского Университета. вып. 1, Москва: Московский Университет, 1969, с.68-81.
4. Бартольд В.В. Историко-географический обзор Ирана. СПб: Типография В.Киршбаума, 1903, 176 с.
5. Вамбери Герман. История Бохары ими Трансоксании съ древнейшихъ временъ до настояшаго. Перевод А.И.Павловского, том I-II, С-Петербиргъ: Издание Я.А.Исакова, 1873, XLVII, с.274-226
6. История Узбекской ССР. Том I, Ташкент: АН Узбекской ССР, 1955, 542 с.
7. Миклухо-Маклай Н.Д. Гератское восстание 1535-1536 гг.// Уч.зап. ЛГУ, серия востоковод. наук, 1956, № 195, с. 58-68.

8. Миклухо-Маклай Н.Д. К истории политических взаимоотношений Ирана с Средней Азией в XVI в. крат.сообщения ИВ АН ССР, №4, М., 1952

9. Рахмани А.А. Азербайджан в конце XVI и в XVII веке. Баку:Элм, 1981, 237 с.

10. Туманович Н.Н. Европейские державы в Персидском заливе в XVI-XIX вв. Москва: Наука, 1982, 188 с.

11. دوکتاب نفیس از مدارک اولیه" ـ " تاریخ صفویه "ـ" خلاصه التواریخ "ـ" تاریخ ملا کمال، اراک 1334، ص

12. نصرالله فلسفی. زندگانی شاه عباس اول. جلد 2-1، تهران: انتشارات علمی، ه.1364، ص 309-738 .

## Struggle of Safavids for Herat

**Summary**

It is important to study the Safavid fight for Herat on the basis of primary sources. Herat had an economically and politically strong potential. Herat was the main center of power of Central Asia, which was ruled by shamlu tribe. At the same time, the shamlus took part in the battle for the Safavid Crown. The article describes the political events that took place during reign of Shah Mohammed Khudabanda and Shah Abbas period.

## Борьба Сефевидов за Герат

**Резюме**

Важно изучить борьбу Сефевидов за Герат на основе первоисточников. Герат имел экономически и политически сильный потенциал. Герат был центром власти Средней Азии, которой управляло племя шамлу. В то же время племя шамлу принял участие в битве за Сефевидскую корону. В статье описываются политические события, которые произошли во времена шаха Мухаммеда Худабанды и шаха Аббаса.

**Rəyçi: dos. M.Abdullayev**

## SOSİOLOGİYA SOSİOLOGY СОЦИОЛОГИЯ

**T.M. Tardaskina, L.D. Bogatyreva**
Odesa National Academy of Telecommunication named of A.C.Popov

# FORMS OF VENTURE INVESTMENT OF INTERNET PROJECTS

***Key words:*** *internet projects, investment, business, start-up, technology sector*
***Açar sözlər****: internet layihəiər,investisiya, biznes mühiti , texnoloji sektorun rolu*
***Ключевые слова:*** *интернет-проекты, инвестиции, бизнес, стартап, технологический сектор*

The economic situation in the country forces start-up companies to develop in conditions of extreme uncertainty. Market conjuncture changes at a fast pace, conditions are dictated by unexpected leaders, new technologies change the ratio of values in the market. Solutions appear to radically change the basic properties of products that they previously competed with each other. These are so-called "subversive innovations". Among the most promising branches of the economy, where such deep innovations are possible, we can call nanotechnology, energy, medicine, biotechnology and, of course, the technology sector - the subject of our research - Internet projects. The development of the latter is inevitably linked to the growing need for capital for both the improvement of the most innovative product (service) and marketing activities, without which it is impossible to rapidly promote a new product to the minds of a wide audience [1].

But no expert will be able to give a precise forecast whether the planned product will be fully realized and whether its market will accept, and therefore, whether the return of investors' investments will take place. Due to high risks of capital investments, such investments are called venture (risk).

So, we define the venture investment as an investment in an innovative project at the "seed" stage and the "start up" stage, in exchange for the company's share and in terms of profits from the sale of this share in the future due to the rapid growth of the company's capitalization. More than 80% of the business angels' capital and venture capital funds, which are venture market players, are implemented in high technology [1].

In essence, venture capital investment becomes the basic catalyst for the development of small and medium-sized businesses, which forms the basis of the Internet economy. The popularity of this type of investment is due to the fact that young companies can turn to it when other sources of financing have abandoned risky investments.

Despite the significant growth of venture capital investments in the Ukrainian economy, the theoretical issues of this process remain inadequate. In particular, even practitioners do not always have a clear idea of the similarities and differences in the work of business angels and venture capital, mix these concepts, experience difficulties in allocating the structure of criteria for the venture capital market players, and parallel processes with similar processes in the western countries.

The main players in the venture capital market are "business" angels and venture funds on the "seed", the initial stage and the stage of growth of the startup. Typically, the nature of their interaction can be defined as cooperation, and not as a competition. They connect to projects at different stages of development: business angels - at the stage of the idea and business formation, venture funds work with an already existing company that takes the first steps in the market. Among the common features in business angels and venture funds, we will highlight the following:

- investment is made in exchange for a share in the company's equity in the early stages of its development;
- investments finance the growth and development of the company, rather than cover the losses of previous periods. The main task is to achieve rapid growth of value and capitalization of business;
- active work or supervision of the activities of the invested objects;
- In addition to financing, business angels and venture capitalists provide additional services to startups: management and marketing consulting (mentoring), expansion of social and economic ties of the company, legal and other services;
- the pursuit of a high rate of return on investment.

Due to the fact that these subjects have more differences than similarfeatures, an analysis of the activity of each of these entities is necessary to reflect the objective situation in the market of venture capital.An interesting category for venture capital market participants seems to be business angels.

First of all, this is due to the extreme heterogeneity of the participants. The generalization of the ir characteristics is very difficult, and the business angels are usually non-public. Access to information on concluded transactions is limited. One of the important features of these subjects in the market is not so much the desire to obtain extra profits, but a mission to support entrepreneurship as a way of life. We propose the following definition of business angels: these are individuals or corporations that use limited own funds to support business in the initial (including "seed") stages of development.

Speaking about sources of investment capital, in most cases it is the result of their previous entre preneurial activity, including sales of independently built businesses. Working with new start projects for them - in many respects reproduction of already used models of doing business, reflecting the need for self-realization, respect and recognition of the younger generation of entrepreneurs, emotional satisfaction and pleasure. If financing of venture funds can be called risky, then the capital of businessangels experts define as extremely risky.

This is due to the fact that the object for investing - as a rule, a company without achievements, and more often than not - just an idea, sometimes even without a full-fledged professional team. The reason for such investments with the highest risks is the highest return on investment when investing at this stage of business development. The research of American specialists reflects the following difference in profitability: when investing in the "seed" / early stage of business development, the average annual yield to the fifth year of existence reaches 65%, with investments in the late stage in the same period, the average yield does not exceed 32% [1, 2 ].

Note that one of the important reasons for the positive development of business angel financing is the ratio of "demand and supply" in the market of startup projects. The number of professional venture funds, especially in Ukraine, remains insufficient to fund all high-quality ideas. The size of the allocated start-up capital is increasing, requirements for projects are tightened. A niche of projects with lower funding requirements appears, with no professional knowledge to prepare the project for the investment search process. It is precisely in this niche that business angels, who, along with the function of financing, have the role of mentoring [1, 2].

- According to research by specialized research centers on venture investment (such as the Venture Capital Research Center at the University of New Hampshire, Harvard University, USA, etc.), the business angels community in the United States is characterized by the following indicators:
- more than 90% of investors - men;
- More than 67% of investors - over 46 years old, the average age is 49 years. However, for the past 10 years, trends have emerged for the emergence of younger investors who have previously created high-tech companies and successfully sold them, releasing capital for new projects;
- more than 78% of investors have significant investment experience (5 years or more);
- The average investment of a private investor - 72 thousand US dollars The range in which business angels usually work - from 20 to 250 thousand. US dollars [3]
- Due to the fact that the boom of the instant takeoff of technology companies and their rapid withdrawal to the IPO, which was observed in the early 2000s, ended, the period of growth and capital requirements for companies is becoming more adequate - 3-7 years. In these conditions, the cooperation of two categories of investors - business angels and venture funds - is an integral element and the basis of the entire financing process.
- The basic function of venture funds is the placement of the capital of its investors in order to maximize profits. Thus, we will define a venture fund as a mechanism for investing capital through the formation of a common fund (partnerships of individual investors) into high-risk innovative enterprises. A distinctive feature of the activity of venture funds can be called exceptional professionalism. It is a kind of whole industry for selection, qualitative assessment and analysis of projects, as well as further support for their development, which is accompanied by a staff of highly qualified consultants - financiers, lawyers, andmarketeers. Summarizing, we will mention the main directions of the development of venture capital investment in our country:
- the necessity of globalization of the innovative sphere by attracting international "smart" money and integration into global technological processes;
- growth of investment attractiveness of innovative companies in Ukraine;

- infrastructure development to support startup companies;
- development of professionalism of participants in the venture market;
- improving the quality of innovative projects, stimulating the consumption of innovative products;
- popularization of innovative and entrepreneurial activity in society, creation of interest in venture and business angelic activity.

So, the research of investment models inevitably requires a detailed analysis of the subjects acting on the venture market. Business angels and venture funds are directly involved in shaping the business processes of young companies. In essence, they can be called donors for innovative processes that create the potential for growth of the Ukrainian economy. A clear understanding of the specifics and motives of the behavior of venture capital investors, the adaptation of approved western models of their work to Ukrainian practice, formalization of criteria of activity, generalization of existing experience, development of directions for the development of the innovation-venture ecosystem of the country create a serious theoretical basis for stable and confident development of the market of venture capital of Ukraine.

## Literature:

1. Пауэр Д., Хилл Б. Бизнес-ангелы: как привлечь их деньги и опыт под
1. реализацию своих бизнес-идей: Пер. с англ. - М.: Эксмо, 2008. - 496 с.
2. Рис Э. Бизнес с нуля: Метод Lean Startup для быстрого тестирования идей и выбора бизнес-модели: Пер. с англ. А. Стативка. - М.: Альпина Паблишер, 2012. - 253 с.
3. Money Tree. Навигатор венчурного рынка. Обзор венчурных сделок ИТ-сектора Украины за 2013 год // PwC. - 2013 [Электронный ресурс]. Режим доступа: http://www.pwc.ua/en_RU/ua/technology/assets/money-tree-2013-rus.pdf

## İnternet layihələrin vençur maliyyələşdirilməsi formaları

### Xülasə

Gənc kompaniyaların biznes proseslərinin formalaşdırılmasında biznes modelləri və vençur fondlar birbaşa iştirak edir. Hətta onları maliyyə proseslərinin donoru adlandırmaq olar. Bu isə onların Ukrayna iqtisadiyyatının inkişafına göstərdikləri dəstəklə bağlıdır. Vençur investorlarının hərəkət motivləri, aprobasiya keçmiş Qərb modellərinin adaptasiya yolları müəyyənləşdirilib. Ölkənin vençur kapitalının ekosistemi Ukraynanın stabil və dayanıqlı vençur kapitalı bazarının formalaşması üçün nəzəzri bazadır.

## Формы венчурных инвестиций интернет-проектов

### Резюме

Бизнес-модели и венчурные фонды принимают непосредственное участие в формировании бизнес-процессов молодых компаний. По сути, их можно назвать донорами для инновационных процессов, которые создают потенциал для роста украинской экономики. Определены мотивы поведения венчурных инвесторов, адаптации апробированных западных моделей их работы к украинской практике. Экосистема венчурного капитала страны создает серьезную теоретическую основу для стабильного и устойчивого развития рынка венчурного капитала в Украине.

# TƏDRİSİN METODİKASI
# THE METHODOLOGY OF TEACHING
# МЕТОДИКА ПРЕПОДАВАНИЯ

**Мамедова Егана Исраил гызы**
Азербайджанский государственный
университет нефти и промышленности
yenana@mail.ru

## ОСОБЕННОСТИ ПРЕПОДАВАНИЯ РУССКОГО ЯЗЫКА В ТЕХНИЧЕСКИХ ВУЗАХ

***Ключевые слова:*** *общение, сложный мир, языковые особенности, особая лексика, национальные группы*
***Açar sözlər:*** *ünsiyyət, kompleks dünya, linqvistik xüsusiyyətlər, xüsusi söz, milli qruplar*
***Key words:*** *communication, complex world, linguistic features, special vocabulary, national groups*

Чем выше уровень культуры человека, в том числе и речевой, тем продуктивнее будет решать задачи профессиональной деятельности. Изучение русского языка особенно важно для представителей технических специальностей, ведь именно эта теория студентов составляет потенциал научно-технической интеллигенции общества.

Будущие специалисты должны быть, прежде всего, субъектом культуры, носителем высокой нравственности и социальной активности, всесторонне эрудированным. Ведь еще в прошлом всемирным интересом по инженерному образованию были сформулированы требования к выпускнику инженерного вуза, среди которых помимо профессиональной компетенции, коммуникативная готовность, владение литературной, деловой письменной и устной речью на родном языке, знание этики общения. Проблема повышения коммуникативной культуры является особенно актуальной для высшего технического образования. Кроме того, в современных условиях низкая речевая культура является фактором, отрицательно влияющим на конкурентоспособность специалистов технической сферы. Таким образом, вся учебная работа по обучению культуры речи в вузовских условиях должна основываться на учебных текстах и быть, во-первых, направленной на их анализ, во-вторых, с опорой на них.

Обучение орфоэпической, словоупотребительной грамматической культуре должно происходить на текстовой синтаксической основе чтения и анализ актуальных связных текстов соответствующей, профессионально значимой тематики. А также при обучении культуре речи студентов-техников необходим уклон в их профессиональную речь, особенно в профессиональную терминологию), но в то же врем по возможности следует обучать и другим общекультурным речевым умениям.

В вузе на 1 курсе на занятиях по русскому языку и культуре речи происходит формирование и дальнейшее развитие навыков профессионально-ориентированной культуры речи. На этом этапе студенты овладевают профессиональной речевой культурой в творческих упражнениях и заданиях, а значит, и в естественной речевой ситуации в процессе коммуникативной деятельности. В вузе работа должна строиться не на повторении школьного дидактического материала, а на дальнейшем развитии речевых навыков.

В практике обучения русскому языку студентов национальных вузов основное место занимают чтение и систематические упражнения, направленные на развитие устной и письменной речи.

Изучение грамматических тем должно вестись на материале изучаемых текстов, насыщенных отрабатываемыми грамматическими формами.

Надо добиться того, чтоб русская речь студента звучала в правильной фонетика-интонационной форме и реализовалась в темпе естественного общения. Поэтому в самом начале курса обучения русскому языку нужно вести интенсивную работу над постановкой произношения. Это тем более необходимо, что, как показывают наши многолетние наблюдения, многие выпускники средней школы по различным причинам не научились правильно произносить отдельные звуки русского языка, слова и предложения.

При обучении русскому произношению студентов нужно учитывать их знания по фонетике родного языка, их произносительные привычки и умения, способность подражать и, наконец, преподносимые им знания по фонетике русского языка. Для выработки произносительных навыков полезны следующие упражнения:

Тренировочно-произносительные (для выработки правильных языков произношения отдельных звуков и звукосочетании):

а) многократное индивидуальное и хорошее произношение;

б) сопоставительное произношение двух звуков (твердых-мягких, звонких-глухих);

в) чтение слов, в которых смягчаются, озвончаются или оглушаются согласные;

г) самостоятельное воспроизведение слов, содержащих требуемые звуки, и т.д.

Однако подобные упражнения не должны быть самоцелью, произношение звуков необходимо обработать в речевом потоке, поэтому необходимы синтетические упражнения (устные и письменно-устные):

а) фонетическое чтение знакомого текста (чтение вслух);

б) заучивание и воспроизведение стихотворения или прозаических отрывков, содержащих звуки, специфичные для русского языка.

Для правильного говорения на русском языке очень важно овладение русской интонацией, так как ошибки в интонации приводят к искажению смысла высказывания. Работу над интонацией приходится вести в течение всего курса обучения русскому языку.

Формирование навыков устной речи – процесс сложный и достигается в результате выполнения обучающимися целой системы упражнений. Как известно, устная речь состоит из процесса понимания и процесса говорения. Пересказ, будучи одним из видов речевой деятельности, является процессом говорения. Однако пересказ способствует развитию не только навыков говорения, но и навыков слушания, особенно тогда, когда это является пересказом прослушанного. Способствуя развитию устной речи, пересказ является переходным этапом на пути к свободному владению языком.

Роль пересказа особенно значительна в занятиях по русскому языку со студентами национальных групп, обучающимися на одном языке. Как показывает практика, успех обучения русскому языку студентов во многом зависит от умелой и целенаправленной работы по выработке навыков пересказа.

Пересказ способствует запоминанию изучаемого языкового материала. Неоднократное чтение текста, осмысление слов, их грамматических форм и синтаксических конструкций приводит к их запоминанию.

Поскольку выпускникам вузов, людям с высшим образованием, в жизни приходится соприкасаться с общеупотребительной, художественной, научно-популярной, публицистической речью, то необходимо учить студентов всем этим видам речи. Следовательно, на занятиях по русскому языку в вузе нужно использовать не только художественные, но и научные (специальные), научно-популярные и публицистические тексты.

Вкратце остановимся на целесообразности использования разных видов связных текстов.

Художественные тексты отличаются образностью, эмоциональностью, они содержат образцы общеупотребительной речи, в них заключены огромные возможности для воспитания высокой общеязыковой культуры студентов, для выработки у них языкового чутья. Как показывает практика, отработка определенных грамматических категорий путем изучения связных художественных текстов дают положительные результаты.

Научно-популярная литература совмещает в себе логическую стройность научной и образность художественной литературы. Связные научно-популярные тексты содержат образцы рассуждений, способствующих развитию логического мышления студентов; они расширяют общий кругозор студентов, воспитывают интерес к знаниям.

Будучи рассчитанной на широкий круг читателей, публицистическая литература в виде газет и журналов отличается

Четкостью, ясностью изложения, простотой и доступностью языка. Отражая нашу обширную общественно-политическую лексику. Поэтому, широко используя газетные и журнальные тексты, можно обогатить словарь студентов общественно-политической лексикой, выработать у них навыки публицистической речи.

Несколько подробнее остановимся на использовании газетного материала в качестве публицистической литературы.

Газетные статьи отражают события дня, содержат общественно-политический и художественный материал на бытовые темы.

Имея большое воспитательное значение, газетный материал в то же время способствует усвоению студентами определенной лексики, необходимой для ведения беседы на общественно-политические и бытовые темы.

Нужно заинтересовать студентов газетным материалом, приучить их к чтению газеты на русском языке. Поэтому следует подбирать такой материал, который заинтересовал бы студентов.

**Литература:**

1. Н.М. Шанский, В.В. Иванов «Современный русский язык» М , Изд-во «Просвещение», 1981 г.
2. В.В. Виноградов Русский язык. 2-е изд. М., 1972.
3. В.В. Виноградов О формах слова.– Изв. АН СССР. Отд-ние лит. и яз., 1944.
4. В.В. Виноградов Основные типы лексических значений слов.– Вопр. языкознания, 1953, № 5
5. П.Н. Денисов Лексика русского языка и принципы ее описания М., Русский язык, 1980
6. А.В. Калинин Лексика русского языка, 2-е изд. М., 1971
7. В.В. Лопатин Рождение слова. М.,1973.
8. Ю.В. Откупщиков. К истокам слова. Рассказы о науке этимологии. Л., Просвещение, 1968

**Texniki universitetlərdə rus dilinin tədrisi xüsusiyyətləri**
**Xülasə**

Bu məqalə "Texniki universitetlərdə rus dilinin tədrisi xüsusiyyətləri" ali təhsil müəssisələrinin tələbələri üçün nəzərdə tutulmuşdur, praktiki yönümlüdür, kommunikativ hərəkətləri necə aparmağı öyrədir. Bakalavr texniki universitetləri hazırlayarkən bu iş arzu edilir. İşin strukturu belədir ki, rus dilinin kompleks dünyasına daxil olan bir fəsildə açılır: dil və danışma konsepsiyaları, dil xüsusiyyətləri arasındakı fərqi ortaya qoyur, müəyyən anlayışlar və əsas şərtlər təqdim edir.

Burada onlar üçün leksik və qrammatik təlimlər mətni seçilir. Həm də bu iş gələcəkdə xüsusi texniki lüğətlərin daha dərin öyrənilməsi, eləcə də milli qrupların tələbələri üçün rus dilinin inkişafı üçün əsas ola bilər.

**Features of teaching Russian language in technical universities**
**Summary**

This article "Features of teaching Russian in technical universities" is intended for students of higher educational institutions, has a practical orientation, teaches the implementation of communication actions. This job is desirable when preparing bachelor technical universities. The structure of the work is such that it opens witha chapter that enters the complex world of the Russian language: it reveals thedifference between the concepts of language and speech, the features of the language, introduces certain concepts and basic terms.

Here are selected texts lexical and grammatical exercises for them. And also this work in the following can serve as a basis for a deeper study of special technical vocabulary, as well as the development of Russian speech of students of national groups.

**Рецензент: доц. Г.Кулизаде**

**Əsədova Fatma Ağası qızı**
Bakı Slavyan Universiteti

# ÜMUMTƏHSİL MƏKTƏBLƏRİNDƏ "KURİKULUM" PROQRAMININ TƏTBİQİ VƏZİYYƏTİ

***Açar sözlər**: kurikulum, ümumtəhsil, tərəqqi, yeni yanaşma, konseptual sənət*
***Keywords:** curriculum, general education, progress, new approach, conceptual art*
***Ключевые слова:** курикулум, общеобразовательный, процветание, новый подход, концептуальный документ*

Hər bir ölkənin tərəqqisi,ilk növbədə həmin ölkədə təhsilin inkişafı ilə bağlıdır. Hər bir xalqın milli-mənəvi dəyərlərini yaşadan, inkişaf etdirən, ilk növbədə, onun dilidir. Dil hər bir xalqın varlığının ən əsas, yeganə təminatçısıdır.Azərbaycan xalqının da ana dili onun milli varlığını müəyyən edən başlıca amıllərdəndir. Ana dilimiz xalqın keçdiyi bütün tarixi mərhələlərdə onunla birgə olmuş, onun taleyini yaşamışdır. Əsrlər, qərinələrdir ki, xalqımızın ədəbiyaşarlığına xidmət edən ana dilimiz qədim tarixə malik olan, min illər müxtəlif mübarizələrdən üzüağ çıxaraq müasir dövrə gəlib çatmış ən böyük sərvətimizdir. Ana dilimiz dövlət rəmzimiz olan himn, gerb, bayraq kimi müqəddəsdir.

Müasir Azərbaycanda dil siyasəti və dil quruculuğu sahəsində sistem yaradan, onu uğurla həyata keçirib başa çatdıran ulu öndər Heydər Əliyev, ali və orta məktədə, təhsilə və maarifə daim diqqət yetirirdi. O, dəfələrlə ali məktəb rəhbərlərinin iştirakı ilə müşavirə keçirir, nöqsanları göstərir, təhsilin təkmilləşməsi imkanlarını müzakirə edir və perspektivlər müəyyənləşdirirdi.

Qloballaşan dünyada hər bir sağlam cəmiyyətin və insanın inkişafında müasir təhsil başlıca məqsəd, həmin məqsədə çatmaq üçün yeganə vasitə təhsildir. Bütün xalqların, dövlətlərin yaxın və uzaq keçmişi, inkişaf yolunun öyrənilməsi təhsillə bağlıdır. Bu gün ölkəmizdə vətəndaş cəmiyyətinin formalaşması da təhsilin müasirliyindən asılıdır.

Təhsil sahəsində İslahat Proqramının ölkəmizdə beynəlxalq təcrübəyə uyğun səmərəli həyata keçirilməsini təmin məqsədilə(H.Əliyevin ideyası ilə) 1999-cu il iyun ayının 29-da etmək Azərbaycan hökuməti və Dünya Bankı arasında imzalanmış "Təhsil İslahatı Proqramı" 1999-cu ildən başlayaraq indiyə kimi həyata keçirilir. Dünya təhsilinin qabaqcıl təcrübəsini öyrənmək, mütərəqqi cəhətlərini milli və tarixi dəyərlərimizi nəzərə almaqla tətbiq etmək, Azərbaycanda şəxsiyyətyönümlü və nəticəyönümlü təhsilin gerçəkləşməsinə nail olmaq bu proqramın qarşıya qoyduğu əsas məsələrdir. Aparılan məzmun islahatları bu mühüm vəzifələrin reallaşmasına, standartlara əsaslanan təhsil sisteminin qurulmasına, dil siyasəti sahəsində nəzərdə tutmuş qərarların həyata keçməsinə xidmət edir(1,46).

Təhsil sahəsində aparılan islahatların 1999-2003-cü illəri əhatə edən birinci mərhələsi öyrədici-innovasiya xarakteri daşısa da, 2004-2007-ci illəri özündə birləşdirən ikinci dövr müasir yanaşmaların tətbiqi baxımından xeyli məhsuldar olmuş, bu mərhələdə təhsil sektorunun inkişafı layihəsi çərçivəsində ölkəmizin ümumi təhsil sistemi üçün aktual sayılan problemlərin həllinə yönəlmiş istiqamətlər (məzmun, dərslik siyasəti və müəllim hazırlığının yenidən qurulması, adambaşına maliyələşdirmə, şagird nəaliyyətlərinin qiymətləndirilməsi və s.) üzrə əhəmiyyətli işlər həyata keçirilmişdir(1,5).

İslahatların başlanmasından ötən müddətdə ümumi təhsilin məzmununun müasir tələblər zəminində yeniləşdirilməsinə xüsusi diqqət yetirilmiş, bu istiqamətdə görülən işlər, inkişaf etmiş dünya dövlətlərində olduğu kimi "Kurukulum islahatları" çərçivəsində ölkəmizdə "Kurikulum siyasətinin əsası" qoyulmuşdur. Respublika Nazirlər Kabinetinin 30 oktyabr 2006-cı il tarixli, 233 nömrəli qərarı ilə təsdiq olunmuş "Azərbaycan Respublikasında ümumi təhsilin Konservasiyası" (Milli Kurikulum) sənədində dövlətin ümumu təhsillə bağlı siyasəti, cəmiyyətin ehtiyac və tələbatı, eləcə də şagirdlərin maraqları üzərində üzvi şəkildə əlaqələndirilmişdir.

Kurikulum müasir dərs modelinin əsas çərçivələri üzrə fənlər kursunun hər bir bölməsinin məqsədini, məzmununu, tədris, təlim fəaliyyətini, nailiyyətini, onların qiymətləndirilməsini əks etdirir.

Ana dili kurikulumu nədir?

Ana dili kurikulumu bu fənn üzrə məqsəd və vəzifələri müəyyənləşdirən və ona istiqamətlənmiş standartların reallaşması üçün zəruri fəaliyyətləri əhatə edən konseptual sənəddir. Bu sənədhazırlanarkən cəmiyyətimizin ehtiyac və tələbatları şagirdlərin imkanını, meyli və maraqları nəzərə alınmışdır.

